est, Hungary, 2000. In: Wheat in a Global Environment (Bedo Z., Lang L., eds.), Kluwer Academic Publishers, Dordrecht, Boston, London **9:** 693-698.

**Aliyev J.A.** (2012) Physiological and molecular bases of drought tolerance in wheat (*Trticum* L.) genotypes. In: D.F. Neves, J.D. Sanz (eds.) Environmental Science, Engineering and Technology. Drought: New Research, Nova Science Publishers, Inc., New York, **2:** 47-95

**Anderson M., Prasad T., Stewart C. et al.** (1995) Changes in isozyme profiles of catalase, peroxidase, and glytathione reductase during acclimation to chilling in mesocotyls of maize seedlings. Plant Physiol., **109:** 1247-1257

**Asish K., Bandhu P., Das A.** (2005) Salt tolerance and salinity effects on plants: a review. Ecotoxicology and Environmental Safety, **60:** 324-349

**Bechtold U., Richard O., Zamboni A. et al.** (2008) Impact of chloroplastic- and extracellular-sourced ROS on high light-responsive gene expression in *Arabidopsis*. J Exp. Botany, **59:** 121-133

**Breusegem F.** (2000) Dual action of the active oxygen species during plant stress responses. Cell. Mol. Life Sci., **57:** 779-795.

**Bunkelman J., Trelease R.** (1996) Ascorbate peroxidase: a prominent membrane protein in oilseed glyoxysomes. Plant Physiol., **110:** 589-598

**Chatzidimitriadou K., Nianiou-Obeidat I., Madesis P. et al.** (2009) Expression of SOD transgene in pepper confers stress tolerance and improves shoot regeneration. Electronic Journal of Biotechnology, **12(40):** 1-9

**Dash S, Mohanty N.** (2002) Response of seedlings to heat-stress in cultivars of wheat: growth temperature-dependent differential modulation of photosystems 1 and 2 activity, and foliar antioxidant defense capacity. Journal of Plant Physiology, **159:** 49-59.

**Dat, J., Vandenabeele S., Vranová E. et al.** (2000) Dual action of the active oxygen species during plant stress responses. Cell Mol. Life Sci., **57(5):** 779-95

**El-Fadly G.A.B., Menshawy A.M., Farhat W.Z.E.** (2007) Molecular and biochemical studies on some bread wheat genotypes in relation to water stress tolerance. African Crop Science Conference Proceedings, **8:** 605-612

**Esfandiari E., Shekari F., Esfandiari M.** (2007) The effect of salt stress on antioxidant enzymes activity and lipid peroxidation on the wheat seedlings. Not. Bot. Agrobot. Cluj., **35:** 48-56

**Fu J., Huang B.** (2001) Involvement of antioxidants and lipid peroxidation in the adaptation of two cool-season grasses to localized drought stress. Environm. and Experimen. Botany, **45:** 105-114

**Gomez J., Jimenez A., Olmos E., Sevilla F.** (2004) Location and effects of long-term NaCl stress on superoxide dismutase and ascorbate peroxidase isoenzymes of pea (*Pisum sativum* cv. Puget) chloroplasts. J. Exp. Botany, **55:** 119-130

**Huseynova I.M.** (2012) Photosynthetic characteristics and enzymatic antioxidant capacity of leaves from wheat cultivars exposed to drought. Biochimica et Biophysica Acta, **1817:** 1516-1523

**Huseynova I.M., Suleymanov S.Y., Rustamova S.M.** (2010) Response of photosynthetic apparatus and antioxidant defense systems in *Triticum aestivum* L. genotypes subjected to drought stress. Proceedings of ANAS (Biological Sciences), **65(5-6):** 49-59

**Ishikawa T., Yoshimura K., Sakai K. et al.** (1998) Molecular characterization and physiological role of a glyxisome-bound ascorbate peroxidase from spinach. Plant Cell Physiol., **39:** 23-34

**Iturbe-Ormaetxe I., Escuredo P., Arrese-Igor C., Becana M.** (1998) Oxidative damage in pea plants exposed to water deficit or paraguat. Plant Physiol., **116:** 173-181

**Khan N., Naqvi F.N.** (2010) Effect of water stress on lipid peroxidation and antioxidant enzymes in local bread wheat hexaploids. Journal of Food, Agriculture and Environment, **8(2):** 521-526

**Laemmli U.** (1970) Cleavage of structural proteins during the assembly of the head of bacteriophage $T_4$. Nature, **227:** 680-685

**Luna C., Pastori G., Driscoll S. et al.** (2004) Drought controls on $H_2O_2$ accumulation, catalase (CAT) activity and CAT gene expression in wheat. J. Exp. Bot., **56:** 417-423

**Mittler R., Zilinskas B.** (1993) Detection of ascorbate peroxidase activity on native gels by inhibition of the ascorbate dependent reduction of nitro blue tetrazolium. Anal. Biochem., **212:** 540-546

**Mittler R., Zilinskas B.** (1992) Molecular cloning and characterization of a gene encoding pea cytosolic ascorbate peroxidase. J. Biol. Chem., **267:** 21802-21807

**Mittova V., Tal M., Volokita M., Guy M.** (2003) Up-regulation of the leaf mitochondrial and peroxisomal antioxidative systems in response to salt-induced oxidative stress in the wild salt-tolerant tomato species *Lycopersicon pennellii*. Plant Cell Envir., **26:** 845-856

**Muscolo A., Sidari M., Panuccio M.** (2003) Tolerance of kikuyu grass to long term salt stress is associated with induction antioxidant defenses. Plant Growth Regulation, **41:** 57-62

**Navari-Izzo F., Quartassi M., Pinzino C. et al.** (1998) Thylakoid-bound and stromal enzymes in wheat treated with excess copper. Physiol. Plant., **104:** 630-638

**Parida A., Das A., Mohanty P.** (2004) Defense

potentials to NaCl in a mangrove *Bruguiera parviflora*: differential changes of isoform of some antioxidative enzymes. J. Plant Physiol., **161:**531-542

Passioura J.B., Angus J.F. (2010) Improving productivity of crops in water-limited environments. Advances in Agronomy, **106:** 37-75

**Racchi M.L., Bagnoli F., Balla I., Daut S.** (2001) Differential activity of catalase and superoxide dismutase in seedlings and *in vitro* micro propagated Oak (*Quercus robur* L.). Plant Cell Reports, **20:** 169-174

**Rao M.V., PaliyathG., Ormrod D.P.** (1996) Ultraviolet-B- and ozone-induced biochemical changes in antioxidant enzymes of *Arabidopsis thaliana*. Plant Physiol., **110:** 125-136

**Sairam R.K., Chandrasekar V., Srivastava G.C.** (2001) Comparison of hexaploid and tetraploid wheat cultivars in their responses to water stress. Biologia-plantarum, **44(1):** 89-94

**Santos C., Campos A., Azevedo H., Caldeira G.** (2001) In situ and in vitro senescence induced by KCl stress: nutritional imbalance, lipid peroxidation and antioxidant metabolism. J. Exp. Bot., **52:** 351-360

**Sayar R., Khemira H., Kameli A.., Mosbahi M.** (2008) Physiological tests as predictive appreciation for drought tolerance in durum wheat (*Triticum durum* Desf.). Agronomy research, **6(1):** 79-80

**Scandalios J.G.** (1993) Oxygen stress and superoxide dismutase. Plant Physiol., **101:** 7-12

**Sedmak J.J., Grossberg S.E.** (1977) F rapid, sensitive and versatile assay for protein using Coomassie brilliant blue G 250. Anal. Biochem., **79:** 544-552

**Tas S., Tas B.** (2007) Some physiological responses of drought stress in wheat genotypes with different ploidity in Turkiye. World Journal of Agricultural Scinces, **3:** 178-183

**Yannarelli G.G., Fernandez-Alvarez A.J., Santa-Cruz D.M., Tomaro M.L.** (2007) Glutathione reductase activity and isoforms in leaves and roots of wheat plants subjected to cadmium stress. Phytochemistry, **68:** 505-512

**Zhang J., Kirkham M.** (1994) Drought-stress-induced changes in activities of superoxide dismutase, catalase and peroxidase in wheat species. Plant Cell Physiol., **35:** 785-791

Zhang Q.H., Liu H.S., Meng F.T. et al. (2000) The effect of drought stress on physiological characters of leaves and seed-filling characteristics of the new wheat cultivar Yamai 36 during the late developmental stage. Scientia Agricultura Sinica, **33(4):** 94-96

**İ.R. Hüseynova, D.R. Əliyeva, C.Ə. Əliyev**

## Torpaq Quraqlığına Məruz Qalmış Buğda Bitkisində Antioksidant Fermentlərin Elektroforetik Spektrlərinin Dəyişməsi

Təbii quraqlığın buğda bitkisində antioksidant fermentlərin aktivliyinə təsirini öyrənmək məqsədi ilə sahə şəraitində böyüdülmüş altı müxtəlif yumşaq (*Triticum aestivum* L.) və bərk (*Triticum durum* Desf.) buğda genotipləri üzərində tədqiqatlar aparılmışdır. Nativ PAAG elektroforez metodunun köməyi ilə quraqlığa məruz qalmış buğda yarpaqlarında katalaza fermentinin bir, superoksiddismutazanın altı, askorbatperoksidazanın və qlutationreduktazanın isə hərbirinin yeddi izoforması aşkar olunmuşdur. Göstərilmişdir ki, bugda bitkisində əsas antioksidant fermentlərdən biri olan superoksiddismutazanın hər üç izoforması – Mn-, Fe-, Cu/Zn-SOD fəaliyyət göstərir. Belə qənaətə gəlinmişdir ki, quraqlıq stresi buğda yarpaqlarında APO, SOD, KAT, QTR fermentlərinin aktivliklərinin ilkin vəziyyətlə müqayisədə artmasına səbəb olur. APO və QTR fermentlərinin aktivlikləri daha nəzərəçarpacaq dərəcədə artmışdır ki, bu da stress şəraitində hidrogen peroksidin parçalanmasını həyata keçirən askorbat – qlutation tsiklinin daha intensiv işləməsi ilə əlaqədardır.

**I.M. Huseynova, D.R. Aliyeva, J.A. Aliyev**

**Changes of Electrophoretic Spectra of Antioxidant Enzymes in Wheat Genotypes Subjected to Soil Drought**

Experiments with 6 contrasting bread (*Triticum aestivum* L.) and durum (*Triticum durum* Desf.) wheat genotypes grown under field conditions have been carried out to study the effect of soil drought on antioxidant enzyme activities. Native polyacrylamide gel electrophoresis (PAGE) revealed the presence of 1 isoform of catalase, 6 isoforms of superoxide dismutase, 7 isoforms of ascorbate peroxidase and 7 isoforms of glutathione reductase in wheat leaves during drought. Mn-, Fe-, Cu/Zn containing isoforms of one of the key antioxidant enzymes - superoxide dismutase-were shown to function in wheat plants. It was concluded that drought caused increases in APO, SOD, CAT and GR activities in wheat leaves compared with their initial levels. Increases in APO and GR activities were more pronounced, indicating an intense work of the ascorbate-glutathione cycle, which breaks down $H_2O_2$.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 23-27 (2012)*

# Birincili Bədxassəli Sümük Şişlərinin Və Kəskin Osteomielitin Differensial Diaqnostikasi

**Ə.T.Əmiraslanov, N.V.Qasımov, G.A. Əhmədova**
*Azərbaycan Tibb Universiteti,Bakıxanov küç,23 Bakı AZ1022, Azerbaycan, E-mail:biol@ass.ab.az*

**Tədqiqat işində birincili sümük şişi və kəskin osteomielit xəstəliyi olan şəxslərin qan serumunda ß-trofoblastik qlikoproteinin qatılığı və turş fosfatazanın aktivliyi öyrənilmişdir. Məlum olmuşdur ki, birincili sümük şişi olan xəstələrdən fərqli olaraq, kəskin osteomielit xəstələrinin qan serumunda bu göstəricilərin səviyyəsi dəyişilmir. Hesab edirik ki, qan serumunda ß-trofoblastik qlikoproteinin qatılığını və turş fosfatazanın aktivliyini öyrənməklə bu xəstəliklərin differensial diaqnostikasını aparmaq mümkündür.**
***Açar sözlər***: *bədxassəli sümük şişləri, kəskin osteomielit, ß-trofoblastik qlikoprotein, turş fosfataza*

## GİRİŞ

Klinik onkologiyanın diaqnostika və müalicə baxımından mühüm sahələrindən birini sümük şişləri təşkil edir (Əmiraslanov və Qazıyev, 1997). Xəstəliyə az hallarda rast gəlinsə də, ilkin əlamətlərinin çox təsadüf edilən və qeyri-onkoloji sümük və oynaq xəstəliklərinə bənzəməsi sümük sarkomalarının çox təhlükəli patologiya olduğunu göstərir. Sümüklərin bədxassəli şişlərinin diaqnostikası böyük çətinliklərlə əlaqədardır. Xəstəliyin başlanğıc mərhələsində 60-85% hallarda diaqnostik səhvə yol verilir ki, bunu da şişlərin klinik və morfoloji əlamətlərinin müxtəlifliyi ilə izah etmək olar (Алиев Д.А. и Алиев А.Ю., 1987). Xəstəliyin differensial diaqnostikasındakı çətinlik diaqnostik prosesin müxtəlif mərhələlərində: klinik tədqiqat, şüa və morfoloji diaqnostika zamanı yarana bilər. Sümük şişlərinin klinikasının (ağrı, şişkinlik və ətrafın funksiyasının pozulması) qeyri-spesifikliyi və qeyri-onkoloji xəstəliklərə bənzəməsi (Алиев М.Д. и др., 2008), sümükdəki patoloji dəyişikliklərin və rentgenoloji əlamətlərin çətin verifikasiya olunması müayinənin birinci mərhələsində diaqnostik səhvlərə gətirib çıxarır və xəstələrin ixtisaslaşmış klinikalara vaxtında daxil olmasına mane olur (Берченко, 2002). Stasionara qədərki mərhələdə xəstələrin üçdə biri mütləq əks göstəriş olan fizioterapiya qəbul edirlər.

Sümük şişlərinin diaqnostikasında klinik göstəricilərlə yanaşı standart rentgenoqrafiya, angioqrafiya, ssintiqrafiya, kompyuter tomoqrafiyası (KT) və maqnit-rezonans tomoqrafiyası (MRT) kimi geniş spektrdə instrumental müayinə metodlarından istifadə edilir (Соловьев, 2003; Altuntas et al., 2005). Lakin bir sıra hallarda bu metodların tətbiqində və şişin inkişafının erkən mərhələlərində törəmənin ölçülərinin kiçik olduğu zaman prosesin qiymətləndirilməsində çətinliklər yaranır. Məsələn radioaktiv maddələr sümük toxumasının iltihabi və degenerativ proseslərində də toplanır və ssintiqrafiya zamanı diaqnozun qeyri-düzgün qoyulmasına gətirib çıxarır (DeLaney et al., 2005). KT və MRT böyük maddi vəsait tələb edən və yüksəktexnologiyalı müayinə metodları olduğundan əksər müalicə müəssisələrində bu metodlardan istifadə edilmir. Rentgenoloji müayinə zamanı xəstələrin 85.6%-də patoloji dəyişiklik müşahidə edilsə də, 14.4%-də heç bir əlamət aşkar edilmir və şişə yalançı mənfi diaqnoz qoyulur (Кочергина и др., 2000).

Bədxassəli sümük şişləri ilə ciddi differensial diaqnostika tələb edən əsas patologiya kəskin hematogen osteomielitdir. Əksər hallarda bədxassəli sümük şişlərinin manifestasiyası kəskin hematogen osteomielit yaxud keçirilmiş travmanın nəticəsi kimi qəbul edilir. Kəskin osteomielitin yerli -ocaqlı formasının başlanğıcının osteogen sarkoma və Yuinq sarkomasına bənzəməsi böyük səhv faizinin formalaşması ilə nəticələnir (Song and Sloboda, 2001).

Sümük sisteminin bədxassəli şişlərinin erkən diaqnostikası və qeyri-şiş təbiətli xəstəliklərdən differensial diaqnostikası üçün asan yerinə yetirilən və baha olmayan yeni, o cümlədən laborator metodların işlənib-hazırlanması və praktik tətbiqi əhəmiyyətli hesab edilir. Bu məqsədlə, ß-trofoblastik qlikoproteindən və sümük metabolizminin biokimyəvi markerlərindən olan turş fosfatazadan istifadə edilməsi məqsədəuygun olardı.

*Tədqiqatın məqsədi* - birincili bədxassəli sümük şişləri və kəskin osteomielit olan xəstələrin qan zərdabında ß-trofoblastik qlikoproteinin qatılığının və turş fosfatazanın aktivliyinin müqayisəli öyrənməkdən ibarətdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat işinə ATU-nun Onkoloji klinikasında müayinə və müalicə edilmiş 60 birincili bədxassəli sümük şişi olan xəstə və Elmi-Tədqiqat Travmatologiya və Ortopediya institutunda müalicə olunmuş 20 xəstə daxil etmişik. Kontrol qrupu

müvafiq yaşlı 20 praktik sağlam şəxs təşkil etmişdir. Bədxassəli sümük şişi olan xəstələrin yaşı 11-46 yaş arasında dəyişmiş, orta yaş 18.8 olmuşdur. Xəstələrdən 83.8%-nin yaşı 10- 20 yaşları arasında dəyişmişdir. Kişilər qadınlara nisbətən 1.54 dəfə çox xəstələnmişdir (müvafiq olaraq 60,6% və 39,4%). Tədqiqata daxil olan xəstələrdə şiş 90.2 % halda uzun borulu sümükləri, 9.8% hallarda yastı və xırda sümükləri zədələmişdir. Uzun borulu sümüklərdən ən çox diz oynağı nahiyəsi,yəni bud sümüyünun distal metafizi (49.4%) və qamış və incik sümüklərinin proksimal metafizi (32.6%), 18% halda bazu sümüyünun proksimal metafizi zədələnmişdir.

Xəstəliyin klinik simptomatikasında bədxassəli sümük şişləri üçün xarakterik olan triada özünü göstərmişdir: ağrı, şiş və funksiyanın pozulması. 13.1 % halda ağrı yeganə klinik simptom olmuşdur. Ağrı əsasən küt xarakter daşımış, intensivliyi tədricən, xüsusilə gecələr artmışdır. Yalnız 2.5% halda ilkin simptom kimi əllənən şişin mövcudluğu, əksər hallarda isə (43.4%) hər üç simptom müşahidə edilmişdir. Xəstələr əsasən ağrıdan (96.7%), şişin mövcudluğundan (37.7%), ətrafın funksiyasının pozulmasından (51.6%), şişin palpasiyası zamanı ağrılı olmasından (91.0%) şikayətlənmişlər. Yuinq sarkomalı xəstələrin 56.6%-nin bədən temperaturu 38°C-dən yuxarı, 10.7%-nin temperaturu subfebril olmuşdur.

Xəstələrdən anamnestik məlumatlar topladıqda müəyyən etmişik ki, xəstəliyin diaqnozunun gec qoyulmasının əsas səbəbləri aşağıdakılardır. Birinci səbəb xüsusilə xəstəliyin başlanğıc mərhələlərində klinik simptomatikanın qeyri-müəyyən olması ilə əlaqədar olaraq diaqnostikanın obyektiv çətinliyidir. Ikincisi, valideynlərin uşaqlarını həkimə gec gətirmələridir. Üçüncüsü, bədxassəli şişin manifestasiyasının zədələnmiş ətrafın travması ilə eyni dövrə düşməsidir. Dördüncü səbəb həkimlərin onkoloji sayıqlığının az olmasıdır. Beşincisi uşağın tam müayinə edilməməsi və diaqnozun məhdud diaqnostik metodlardan istifadə edilməklə qoyulmasıdır. Altıncı səbəb - rentgenoloji müayinədən az istifadə edilməsi və alınmış rentgen şəkillərinin düzgün təsvir olunmamasıdır. Yeddincisi hətta cərrahi əməliyyatın icrasından sonra da preparatın morfoloji müayinəyə göndərilməməsidir.

Klinikamızda aparılan diaqnostik proqrama anamnezin toplanması,zədələnmiş sümüyün və döş qəfəsi orqanlarının rentgenoloji müayinəsi, şişin,ətraf yumşaq toxumanın və regionar limfa düyünlərinin ultrasəs müayinəsi, birincili şişin sitotoloji müayinəsi, biopsiya materiallarının və əməliyyatdan sonrakı materialın terapevtik patomorfozun dərəcəsini müəyyənləşdirmək üçün histoloji müayinəsi aparılmışdır. Göstəriş olduqda KT, MRT, skelet sümüklərinin yoxlanılması məqsədilə radioizotop müayinəsi aparılmışdır. Spesifik müalicəyə başlamazdan əvvəl orqanizmin həyati vacib sistemlərinin vəziyyətini qiymətləndirmək üçün aşağıdakı müayinələr aparılıb: qan qrupu,rezus faktor, RW müayinəsi, hepatit B və C markerləri, qanın ümumi analizi; qan zərdabında zülal, bilirubin,sidik turşusu,kreatinin, AST, ALT təyini; sidiyin ümumi analizi; koaquloqramma; EKQ, qarın boşluğu orqanlarının ultrasəs müayinəsi. Bütün xəstələrə rentgenoloji müayinə aparılmışdır. Rentgenoloq aşağıdakı suallara cavab verməyə çalışmışdır: hansı sümük zədələnib; şiş normal yaxud zədələnmiş sümükdə inkişaf etmişdir; şiş sümüyün hansı hissəsində,yəni qabıq qatında ( periferiyada ) yoxsa sümük iliyi kanalında (mərkəzdə) lokalizasiya olunmuşdur; epifizar lövhənin vəziyyəti necədir; şişin və makroskopik olaraq dəyişilməmiş sümüyün sərhədləri hansıdır; şişdə mineralizə olunmuş matriksin formalaşması baş vermişdirmi; şiş kortikal qatdan kənara çıxmışdırmı; patoloji prosesə oynaq qoşulubmu və bu necə baş verib; bir yaxud bir neçə düyün mövcuddur; şiş monomorfdur yoxsa ayrımənşəli sahələrdən ibarətdir.

14 xəstəyə kompyuter tomoqrafiyası aparılmışdır. Əsas kompyuter tomoqrafik əlamətlər aşağıdakı kimi olmuşdur: şişin epimetadiafizdə lokalizasiya olunması, kiçikocaqlı yayılmış destruksiya, sümükdaxilində buludvari və pambıqvari əlavələr, sümük iliyi kanalının endostun parçalanması hesabına genişlənməsi,laylanmış periostal reaksiya, sümükdənxaric komponentdə pambığabənzər ossifikatlar. Kompyuter tomoqrafiyası sayəsində şişin strukturu barəsində daha dəqiq məlumat alınmış, yumşaq toxuma komponentinin mövcudluğu barədə daha ətraflı təsəvvür yaranmış, sümütün kortikal və süngər maddələrinin vəziyyəti öyrənilmişdir.

6 xəstəyə maqnit-rezonans tomoqrafiyası aparılmışdır. Əsas informativ MRT əlamətləri aşagıdakılar olmuşdur:şişdə qeyri-düzgün formalı maye tərkibli sahələrin olması (nekrozlar), şişdə buludabənzər əlavələrin olması, qabıq qatın liflənməsi və kiçik ocaqlı destruksiyası, peritumoral ödem, kollateralların inkişafı. Maqnit-rezonans tomoqrafiyası sayəsində şişin ətraf damar-sinir dəstəsinə, oynağa, sümük iliyinə olan münasibətini müəyyən etməyə imkan yaranmış, əməliyyatdan öncə şişin sərhədləri dəqiq müəyyənləşdirilmiş, kimyəvi dərman müalicəsindən sonra nekrozun dərəcəsi təyin edilmişdir. Bunun sayəsində orqansaxlayıcı əməliyyatlar üçün xəstə kontingenti toplanmış, polikimyəvi müalicənin sonrakı taktikası müəyyən olunmuşdur.

Diaqnoz bütün xəstələrdə morfoloji müayinə metodları, yəni sitoloji və histoloji müayinələr vasitəsilə təsdiq edilmişdir. Tədqiqatın morfoloji metodlarının tətbiqi müalicədən əvvəl açıq biopsiya vasitəsilə götürülmüş bioptat yaxud neoadyuvant

kimyəvi dərman müalicəsindən sonra aparılmış cərrahiyə əməliyyatından sonrakı preparatlar hesabına mümkün olmuşdur.

Birincili bədxassəli sümük şişləri kimi kəskin osteomielit xəstələri də stasionara xəstəliyin erkən mərhələsində müraciət etməmişlər. Bu xəstələrin yalnız 12.3%-i şikayətlərinin yaranmasının birinci günündə həkimə müraciət etmişlər. Xəstələrin əksəriyyəti həkimə xəstəliyin ilkin əlamətlərinin başlanmasının 2-3-cü günündə (34.6%) və yaxud 3-cü gündən 7-ci günə qədər (28%) müraciət etmişlər. Xəstələrin 23.4%-i yalnız 1 həftə sonra, 2 xəstə isə 1 ay sonra klinikaya daxil olmuşlar. 18.5% halda xəstəliyin başlanması xəstələr tərəfindən travma ilə əlaqələndirilmişdir. Ixtisaslaşmış tibb müəssisələrinə gecikmiş mərhələdə daxil olmanın əsas səbəbi uşaqların valideynlərinin onları özbaşına müalicə etməyə cəhd etmələri olmuşdur. Anamnezdən məlum olur ki, xəstəliyin diaqnozu tibb işçiləri tərəfindən 69.4% halda ixtisaslaşmış tibbi yardıma müraciət etmədən 3 gün ərzində qoyulmuşdur. 9.6% halda buna 4-dən 7 günə qədər, 19.2% halda 7-dən 14 günə qədər, yalnız 1.8% halda 2 həftədən çox vaxt tələb olunmuşdur. Bu göstəricilərə əsaslanaraq deyə bilərik ki, xəstəliyin birincili bədxassəli sümük şişlərinə nisbətən daha kəskin başlanması, bu xəstəliyə rastgəlmə tezliyinin yüksək olması və uyğun olaraq həkimlərin də sayıqlığının bir qədər çox olması vaxtında diaqnoz qoymağa imkan vermişdir.

Elmi Tədqiqat Travmatologiya və Ortopediya İnstitutunda xəstələrə anamnestik, hematoloji, rentgenoloji müayinələr aparılmışdır. Əməliyyatdan sonra preparatlara ATU-nun Onkoloji Klinikasının patohistoloji laboratoriyasında baxılmışdır.

Xəstələrdən 45.8%-nin yaşı 10 yaşdan 14 yaşa qədər olmuş, ən çox xəstələnmə 13 yaşlı xəstələr arasında (11.6%) müşahidə edilmişdir. Sümük şişləri kimi kəskin osteomielitli xəstələr arasında da kişilər qadınlara nisbətən çoxluq təşkil etmişdir. Bizim müşahidəmizdə iltihab ocağı əsasən uzun borulu sümüklərdə, 43.6 % halda bud sümüyündə, 34.5% halda baldır sümüyündə lokalizasiya olunmuşdur. Biz tədqiqatımıza kəskin osteomielitin yerli-ocaqlı formasına tutulmuş xəstələri daxil etmişik. Xəstəlik əsasən kəskin başlanğıca malik olmuş, bəzən 1-2 gün ərzində ümumi zəiflik,sümük və oynaqlarda ağrılar olmuşdur. Xəstəliyin ikinci-üçüncü günlərində bədən temperaturu 39-40 °C-yə qədər yüksəlmiş, zədələnmiş ətrafda ağrılar artmışdır. Obyektiv müayinə zamanı ətrafda şişkinlik və ödem, dərinin hiperemiyası müşahidə olunmuşdur. Palpasiya zamanı ağrı, yerli hipertermiya, yumşaq toxumalarda pastozluq diqqəti cəlb etmişdir. Periferik qanın müayinəsində eritrositlərin çökmə sürətinin artması, leykositar formulada sola doğru meyllik , 11-20x$10^{12}$/l çatan leykositoz, anemiya aşkar olunmuşdur.

Bütün xəstələrdə zədələnmiş ətrafın rentgenoqrafiyası icra edilib. Qeyd etməliyik ki, xəstəliyin rentgen diaqnostikası həqiqi destruktiv prosesi əksər hallarda olduğundan zəif əks etdirmişdir. Kəskin osteomielitin ilkin əlamətləri rentgenoqrafiyada xəstəliyin başlanmasından 8-15 gün sonra müşahidə olunmuşdur. 5 xəstədə bu müddətə qədər heç bir rentgenoloji əlamət aşkar olunmamış və yalançı mənfi nəticə əldə olunmuşdur. Kəskin osteomielit xəstəliyinin rentgenoloji mənzərəsi aşağıdakı kimi olmuşdur: yumşaq toxumaların həcminin artması və intensivliyinin yüksəlməsi, əzələarası arakəsmələrin deformasiyası və onların qeyri dəqiq differensiasiyası. Xarakterik əlamətlərdən biri də dərialtı piy təbəqəsinin dəyişilməsi olmuşdur. Normal dərialtı piy təbəqəsi rentgenoqramda eynicinsli homogen şəffaf zona kimi görünür. Hematogen osteomielit zamanı isə dərialtı piy təbəqəsinin ödemi nəticəsində sonuncu ilə əzələ kütləsi arasındakı sərhəddin dəqiqliyi pozulmuş və şəffaflığı itmişdir.

Rentgenoloji dəyişiklik ən çox sümüyün metafizində aşkar edilmişdir. Bu zaman sümük trabekullarının şəkli silinmişdir. Qabıq qatının konturlarının dəqiqliyi azalmış, bəzən tamamilə itmişdir. Xəstəliyin başlanmasından 8-10 gün sonra laylanmış tipli periostal reaksiya qeyd edilmişdir. Kəskin osteomielit xəstəliyinin ən aşkar rentgenoloji əlaməti gec inkişaf etmiş olmasına baxmayaraq sümüyün destruksiyası olmuşdur. Sümüyün destruksiya ocağı kortikal qatın daxilində və metafizin süngər maddəsində müşahidə edilmişdir. Onlar çoxsaylı, kiçik ölçülü, dairəvi yaxuq dartılmış formalı, qeyri-dəqiq konturlu olmuşlar. Sümüyün destruksiya ocaqları öz aralarında birləşərək ləkəli şəffaflıqlar şəklini almışdır. Sümük şəffaflaşmışdır. Sümüyün kortikal qatı qeyri-bərabər nazikləşmişdir.

Bütün kəskin osteomielit xəstələrində əməliyyatdan sonra preparatın histoloji müayinəsi aparılmışdır. Osteomielitin erkən dövrlərdə morfoloji təzahürləri metafizdə sümük iliyini, havers kanallarını və periostu cəlb etməklə diffuz iltihab proses ilə xarakterizə olunur. Hiperemiya, qan damarlarının genişlənməsi, leykosit və eritrositlərin diapedezi, hüceyrəarası infiltrasiya və seroz hopma qeyd edilmişdir. Sümük iliyi kanalı qırmızı və sarı iliklə tutulmuşdur. Bəzi sahələrdə eozonofillərin və süqmentnüvəli neytrofillərin toplanması, tək-tək təsadüf edilən plazmatik hüceyrələr müəyyən olunur. Iltihab və nekrozla yanaşı olaraq güniş qansızma ocaqları da qeyd edilir.

Zədələnmiş hissədə damar divarlarının genişlənməsi və plazmorragiyası, bəzi yerlərdə kompakt sümük lövhələrinin və Havers kanallarının genişlənməsi qeydə alınmışdır. Primitiv sümük elementləri köndələn tiplər halında endostun sümük

yaranmasında iştirak edirlər. Qabıq maddəsində havers kanalları genişlənib, sümük lövhələri nazikləşmişdir.

Sümüyün nekrobiotik dəyişikliyi epifizar qığırdağın yaxınlığında iltihab ocağının sərhəddə xüsusilə kəskin xarakterdə müəyyən edilmişdir. Bu kimi hallarda sümük-qığırdaq lövhələrinin geniş nekrozu nəzərə çarpır.

Osteomielitin daha kəskin mərhələsində irinləmə ocaqlarının ölçüləri,onların lokalizasiyası və digər xüsusiyyətləri irinləmə prosesinin yayılmasından asılı olmuşdur. Daha kəskin mərhələdə yeni nekroz ocaqları əmələ gəlməmiş, sekvestrlərin ölçüləri kiçilmiş, proses lokallaşmışdır.

$ß_1$-TBQ qatılığı "TBQ-İFA-BEST-strip" (Rusiya Federasiyası) firmasının istehsal etdiyi reaktiv dəstinin vasitəsilə immunoferment üsulla təyin edilmişdir.

Ölçmələr STAT Fax 303 Plus (ABŞ) İFA aparatında aparılmışdır.

Qan zərdabında turş fosfataza fermentinin aktivliyi " Hospitex Diaqnostik" (İtaliya) firmasının istehsal etdiyi reaktiv dəstinin vasitəsi ilə kinetik üsulla təyin edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

1 saylı cədvəldən, 1 və 2 saylı şəkillərdən məlum olur ki, kəskin osteomielit olan xəstələrin qan zərdabında ß-TBQ və turş fosfatazanın səviyyəsi kontrol qrupdan statistik etibarlı fərqlənmir. Birincili bədxassəli sümük şişləri olan xəstələrdə bu göstəricilərin səviyyəsi kəskin hematogen osteomielitlə müqayisədə müvafiq olaraq 23.6 və 8 dəfə çox olmuşdur.

**Cədvəl1.** Birincili bədxassəli sümük şişləri və kəskin hematogen osteomielit olan xəstələrin qan zərdabının bəzi biokimyəvi göstəriciləri (*p<0,05).

| Diaqnoz / Göstəricilər | Kontrol qrup (n=22) | Kəskin hematogen osteomielit (n=20) | Bədxassəli sümük şişləri( n=60) |
|---|---|---|---|
| ß-TBQ (nq/ml) | 1,09±0,11 | 1,15±0,3 | 27,16±3,12(19-32)* |
| Turş fosfataza | 2,5±0,16 | 4,06±0,72 | 34,3±1,2 (21-42 )* |




**Şəkil 1.** Xəstələrdə və kontrol qrupa aid olan şəxslərdə ß-TBQ-nin səviyyəsi.




**Şəkil 2.** Xəstələrdə və kontrol qrupa aid olan şəxslərdə turş fosfatazanın səviyyəsi.

Beləliklə, əminliklə qeyd edə bilərik ki, kəskin osteomielit və birincili bədxassəli sümük şişlərinin differensial diaqnostikasında xəstələrin qan zərdabında turş fosfataza və xüsusilə də ß-TBQ-nin göstəricilərini yoxlamaqla mühüm informasiya almaq mümkündür. Xəstənin həkimə ilkin müraciəti zamanı bu göstəricilərin müayinəsi xəstələri vaxtında müvafiq ixtisaslaşmış klinikaya yönəltməyə imkan verə bilər.

## ƏDƏBİYYAT

**Əmiraslanov Ə.T., Qazıyev A.Y.** (1997) Sümük şişləri. Bakı: Təbib, 480 s.

**Алиев Д.А., Алиев А.Ю.** (1987) Ошибки диагностики остеогенной саркомы. Хирургия, **№10:** 117-119

**Алиев М.Д., Тепляков В.В., Махсон А.Н. и др.** (2008) Глава: Первичные злокачественные опухоли костей. Руководство по онкологии (Под ред. Чиссова В.И., Дарьяловой С.Л.). М.: ООО «Медицинское информативное агенство», с. 649.

**Берченко Г.Н.** (2002) Заболевания костно суставной системы. Патология: Руководство (Под ред. М.А.Пальцева, В.С.Паукова, Э.Г. Улумбекова). М.: ГЭОТАР Мед., с. 565-596.

**Кочергина Н.В., Лукьянченко А.Б. и др.** (2000) Ошибки и трудности диагностики первичных злокачественных опухолей костей. Медицинская визуализация, **№4:** 92-97.

**Соловьев Ю.Н.** (2003) Стратегия диагностики опухолей костей: Клинические лекции. Вестник РОНЦ им. Н.Н.Блохина РАМН, **№4:** 8-11.

**Altuntas A.O., Slavin J., Smith P.J. et al.** (2005) Accuracy of computed tomography guided core needle biopsy of musculoskeletal tumours. ANZ J. Surg., **75:** 187-191.

**DeLaney T.F., Park L., Goldberg S.I. et al.** (2005) Radiotherapy for local control of osteosarcoma. Int. J. Radiat. Oncol. Biol. Phys., **61:** 492-498.

**Song K.M., Sloboda J.F.** (2001) Acute hematogenous osteomyelitis in children. J. Am. Academ. Orthop. Surg., **9(3):** 166-168.

**A.T. Amiraslanov, N.V.Qasimov, G.A.Ahmadova**

### The Differential Diagnosis of Primary Benign Tumors and Acute Hematogenous Osteomyelitis

The aim of the study was assessment of ß-TBG and acid phosphotaza on the blood serum in patients with primary bone cancer and acute hematogenous osteomyelitis. The study included materials of 60 patients with primary bone cancer who were examined and treated at the Azerbaijan Medical University Oncology clinic, 20 patients with acute hematogenous osteomyelitis and 22 practically healthy people. The difference between the levels of ß-TBG and acid phosphotaza in the acute hematogenous osteomyelitis patient group is in significant as compared with the control. In patients with primary bone cancer ß-TBG and acid phosphotaza levels were higher by 8 and 23.6 fold ($p<0.05$) compared in patients with acute hematogenous osteomyelitis. Our results suggest that in addition to ß-TBG and acid phosphotaza levels could be useful in differentiation of the primary bone cancer and acute hematogenous osteomyelitis.

**А.Т. Амирасланов, Н.В.Касумов, Г.А.Ахмедова**

### Дифференциальная Диагностика Первичных Опухолей Костей и Острого Гематогенного Остеомиелита

Целью нашего исследования является изучение активности кислой фосфатазы и концентрации β-ТБГ в сыворотке крови больных с первичными опухолями костей и острым гематогенным остеомиелитом. Исследованы сыворотки крови 60 больных со злокачественными опухолями костей, которые лечились в онкологической клинике АМУ и 20 больных с острым гематогенным остеомиелитом, а также 22 практически здоровых людей. В результате исследований мы пришли к выводу, что активность кислой фосфатазы и концентрация β-ТБГ не изменились у больных с острым гематогенным остеомиелитом по сравнению с контрольной группой. У больных с первичными злокачественными опухолями костей активность кислой фосфатазы и концентрация β-ТБГ была соответственно в 8 и 23,6 раза больше, чем у больных острым гематогенным остеомиелитом. Заключение: определение активности кислой фосфатазы и концентрации β-ТБГ в сыворотке крови больных с острым гематогенным остеомиелитом и первичными опухолями костей является одним из основных этапов дифференциальной диагностики этих заболеваний.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 28-33 (2012)*

# Hündürlükdən Asılı Olaraq Erkən Yaz Bitkilərinin Həyati Formaları

**E.S.Şükürov, M.A.Nəbiyev, V.M.Əli-zadə**
*AMEA Botanika İnstitutu, Badamdar şossesi 40, Bakı AZ 1073, Azərbaycan, E-mail: eldar1972@live.com*

**Tədqiqatın məqsədi hündürlükdən asılı olaraq müxtəlif bitkilik tiplərində rast gəlinən erkən yaz ot bitkilərini öyrənmək olmuşdur. Tədqiqat marşrut üsulu ilə dəniz sahilindən başlayaraq ön dağ qurşağına qədər yerinə yetirilmişdir. Tədqiqatın nəticələri göstərmişdir ki, dənizsahili zolaqda rast gəlinən bitkilərin 100%-i birillik, bozqır bitkiliyində rast gəlinən erkən yaz bitkilərinin 100%-i soğanaqlı, meşə bitkiliyində rast gəlinən bitkilərin 50%-i soğanaqlı və 50%-i isə çoxillik bitkilərdir. Belə məlum olmuşdur ki, hündürlükdən asılı olaraq erkən yaz ot bitkilərinin həyati formaları hündürlükdən və nəticə etibarilə iqlim və edafik amillərdən asılı olaraq dəyişir.**

***Açar sözlər:*** *transekt, həyati formalar, efemer, geofit, efemeroid*

## GİRİŞ

Floristik istiqamətlərin tədqiqi biomüxtəlifliyin, o cümlədən fitobiomüxtəlifliyin öyrənilməsi və qorunması kimi müasir qlobal problemlərin həyata keçirilməsində mühüm mərhələ hesab olunur. Bu tip tədqiqatların strategiyası bitki örtüyünün müasir vəziyyəti və onun artan antropogen təsirlərə reaksiyası haqqında elmi əsaslandırılmış məlumatların əldə olunması və bunun əsasında fitobioobyektlərin qorunmasına dair tədbirlərin və təkliflərin işlənməsi ilə təyin olunur.

Hal-hazırda bitki örtüyü, təbii fitosenozlar transformasiyaya məruz qalaraq, əhəmiyyətli dərəcədə antropogen təzyiq nəticəsində antropofitlərlə zəngin dəyişilmiş fitosenozlara çevrilir. Bu zaman flora bütövlükdə az dəyişikliyə məruz qalır və bitki örtüyünün elementar vahidlərini özündə kifayət qədər çox qoruyur, növlərin senopopulyasiyalarının tərkib hissələrindən ibarət bitkilikdən daha davamlı olan və keçmiş təbii fitobiotanın xarakteri haqqında informasiya daşıyır (Прилипко, 1970; Джапова, 2007; Болатчиев, 2011). Bu baxımdan təbii bitki örtüyünün tədqiqində floristik metodlar daha informativ olur.

Böyük Qafqazın cənub-şərq yamacları Xəzər dənizi sahillərindən başlayaraq aşağı meşə qurşağına qədər ərazilər qış otlaqları kimi istifadə olunur. Burada xırda və iri buynuzlu mal-qaranın intensiv otarılması oktyabr ayından başlayaraq may ayına qədər davam edir. May ayından oktyabr ayına qədər isə onlar yaylaqlara köçürlər.

Azərbaycanın şimal-şərq rayonlarının flora və bitkiliyi haqqında ümumi məlumatlar Grossheym, Prilipko və sonralar Şükürov tərəfindən verilmişdir (Şükürov, 1999; Şükürov, 2002; Гроссгейм, 1948; Прилипко, 1970). Ərazinin daha ətraflı floristik tərkibi Şahsuvarov tərəfindən öyrənilərək təkcə Samur-Dəvəçi düzənliyində, Xəzər dənizi sahili zolağında 56 fəsiləyə mənsub 298 növ bitki müəyyən edilmişdir (Шахсуваров, 1994).

Fiziki-coğrafi şəraitin müxtəlifliyi ilə əlaqədar olaraq ərazidə Xəzərətrafı littoral bitkilikdən tutmuş yüksək dağ çəmənləri və bozqırlara qədər müxtəlif bitkilik tipləri formalaşmışdır. Bu müxtəlif bitkilik tiplərində rast gəlinən erkən yaz bitkiləri, fiziki-coğrafi şəraitdən asılı olaraq onların həyati formaları və növ müxtəlifliyi haqqında heç bir ədəbiyyatda rast gəlinmir.

Tədqiqatın məqsədi Xəzər sahilindən başlayaraq orta dag meşə qurşağına qədər marşrut üsulu ilə geobotaniki müşahidələr aparmaq, müxtəlif bitkilik tiplərinin təsvirini və orda rast gəlinən erkən yaz ot bitki növlərinin floristik analizini vermək, sistematik və morfoloji təhlilin müəyyən edilməsindən ibarət olmuşdur. Eyni zamanda qarşıya qoyulmuş əsas vəzifələrdən biri müşahidə olunmuş antropogen və ətraf mühit amillərinin təsirini qiymətləndirmək, hündürlükdən və digər ətraf mühit amillərindən asılı olaraq erkən çiçəkləyən bitkilərin həyati formalarının öyrənilməsi olmuşdur.

**Müşahidə sahələri.** Müşahidələr Giləzi dilindən başlayaraq şimal-qərb istigamətində uzunluğu təxminən 65 km olan üfüqi xətt boyunca hündürlüyü dəniz səviyyəsindən 18-20 m aşağı və 700-800 m yüksək olan sahəni əhatə etmişdir (Şəkil 1).

Regionun Samur-Dəvəçi ovalığının təxminən 1/3 hissəsi okean səviyyəsindən aşağıdadır. Ovalığın ən yüksək nöqtəsi qərbdə ön dağ qurşağı ətəyində 200-215 m-ə çatır. Az mailli Samur-Dəvəçi ovalığında littoral, psammofit, səhra, yarımsəhra, bataqlıq, çala-çəmən, meşə, çılpaq sahələr və oazislər kimi müxtəlif landşaftları mövcuddur. Ön dağ qurşağı dəniz səviyyəsindən 200-250 m-dən 800-1000 m-dək yüksəkliyə qədər olan ərazini əhatə edir.

Babadağdan şərqdə Xaldan ətrafında leyas və dogger çöküntüləri daha az meyilli aşağı enən titon




**Şək. 1.** Tədqiq olunan sahələr.

və neokon lay dəstləri ilə əvəz olunur. Şahdağ zonasının əhəngdaşlarını isə senon gilləri, sonra da senonun mergel qatı əvəz edir.

Geoloqların məlumatlarına görə bu çöküntülər üçüncü dövrə aid gil-qum törəmələrinin üstünü örtmüşdür (Azərbaycan SSR-nin Fiziki Coğrafiyası, 1959). Həmin törəmələr Yan silsilənin ətəkləri zolağında xeyli yayılmışdır. Sonra sahənin artıq ovalıq hissəsində qədim Xəzərin terras çöküntüləri başlayır. Onlar çaqıl yığınlarından, konqlomeratlardan, qum daşlarından, gillərdən, qabıqlı əhəngdaşlarından və sahil boyu hissədə cavan Xəzər töküntülərindən ibarətdir. Azərbaycanın şimal-şərqinin əsas yeraltı sərvəti neft yataqlarıdır. Tədqiq olunan marşrut xətti regionda ən böyük neft yatağı olan Siyəzən neft yatağını kəsib keçir. Hidrokarbonatlı, hidrogen-sulfidli soyuq bulaqlar Çıraqqalada mövcuddur.

Marşrut üzrə rütubətli, şoran, balıqqulağılı qumlu, qumlu, səhra və yarımsəhra, qonur və boz-qonur, bozqırlaşmış qəhvəyi, qara, şabalıdı və dağ-meşə torpaqları formalaşmışdır.

İ.V.Fiqurovskinin göstərdiyinə görə dənizin tədricən geri çəkilməsi nəticəsində sudan azad olan indiki Samur-Dəvəçi və dəniz kənarı düzənliklər isə isti və quru iqlimə malik olmuşdur (Фигуровский, 1926). Aran rayonlarının isti və quru iqlimi həmsərhəd dağətəyi zonanın zəngin subtropik bitki örtüyünə mənfi təsir göstərmiş və bu rayonların iqlimi tədricən hazırkı müasir vəziyyətdə formalaşmışdır.

## OBYEKT VƏ TƏDQİQAT ÜSULLARI

Tədqiqat obyekti Böyük Qafqazın cənub-şərq yamacları, Xəzər dənizi sahillərindən başlayaraq aşağı meşə qurşağına qədər ərazilərin erkən yaz bitkilərinin həyati formalarını və onların rast gəlindiyi təbii bitkilik tiplərinin müasir vəsiyyətini erkən yazda öyrənməkdən ibarət olmuşdur. Müşahidələr 2011-ci il martın 25-də dəniz sahilindən başlayaraq ön dağ qurşağına qədər olan ərazidə səhra, bozqır və meşə bitkilik tiplərində marşrut üsulu ilə aparılmışdır. Ərazinin erkən yaz florasını öyrənən zaman müasir geobotaniki metodlardan istifadə olunmuşdur. Qeyd olunan ərazidə hər birinin ölçüsü 10 min kv.m olmaqla 4 pilot sahədə transekt üsulu ilə yerinə yetirilmişdir. Mart ayında təbiət tam ayılmadığı üçün az sayda çiçəkləyən bitkilərə rast gəlinmişdir. Ona görə də biz yalnız çiçəkləyən ali bitkilərin herbari materiallarını toplayıb, onların "Флора Азербайджана" [1950-1961], çoxcildliklərinə əsasən təyin edilməklə müəyyənləşdirmişik. Toplanmış herbari materialları bitki örtüyünün konspektinin tərtibindən Botanika İnstitutunun herbari fondunun zənginləşdirilməsində istifadə olunmuşdur. Lakin bitkiliyin layihə örtüyü və növ tərkibi pik nöqtəyə çatmadığından fitosenozun strukturu haqqında tam məlumat vermək mümkün deyil. Bitkilərin həyati formalarının təhlili zamanı bir çox alimlərin o cümlədən Raunkiaer, 1934; Serebryakov, 1964; Qovaerts və başqalarının,

2000, istifadə etdikləri təsnifat sistemi nəzərdən keçirilmişdir. Lakin Raunkier və Serebryakovun təsnifatı daha geniş istifadə olunduğu üçün toplanan növlərin təhlili zamanı həyati formalar bu təsnifata görə verilmişdir (Raunkiaer, 1934; Серебряков, 1964).

Regionun bitkilik tiplərini və rast gəlinən erkən yaz bitkilərinin populyasiyalarını müəyyən etmək üçün seçilmiş pilot sahələrdə "transekt" üsulu ilə 1 $m^2$ ölçüsü olan kvadratlardan istifadə olunmuşdur (Phil Barker, 2001). Tədqiqatların həyata keçirildiyi ərazilərin dəniz səviyyəsindən hündürlüyü və koordinatları GPS avadanlığının vasitəsilə təyin edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Əsas nəticələrdən biri kimi dəniz sahilindən başlayaraq ön dağ qurşağına qədər olan ərazidə rast gəlinən müxtəlif bitkilik tiplərində (psammofit, səhra, bozqır və meşə) relyefdən, edafik və iqlim amillərindən asılı olaraq rast gəlinən erkən yaz florasının tərkibi, sistematikası, morfologiyası, həyati formaları öyrənilərək onların müxtəlif yaşayış mühitlərində yayılma qanunauyğunluqları müəyyən edilmişdir. Öyrənilən ərazinin bitki örtüyünün növləri floristik rayonlar və bitki qurşaqları üzrə qeyri-bərabər paylanmışdır. Dəniz səviyyəsindən hündürlüyün artması ilə dendrafloranın originallığı artır.

Ərazidən toplanmış bitkilər 13 növ 7 fəsiləyə mənsubdur. Erkən yaz bitkilərinin zənginliyinə görə birinci yeri *Liliaceae* (5 növ və ya ümumi növlərin 38%-i), ikinci yeri *Asteraceae* və *İridaceae* (2 növ və ya ümumi növlərin 15%-i) fəsilələri tutur. Digər 4 fəsilənin hər birində 1 növ olmaqla ümumi növlərin ayrı-ayrılıqda 8%-ni təşkil edirlər (Şək. 2).

Nümunə sahələrinin yaxınlığında müxtəlif bitkilik tipləri müşahidə edilmişdir. Tədqiqatlar zamanı erkən çiçəkləyən yaz bitki nümunələri toplanılmış və bitkilik tipləri haqqında qısa məlumat verilmişdir.

**Efemerli hərəkətli qumlu səhralar.** Tədqiqatların həyata keçirildiyi dəniz sahili boyu rütubətli şoran torpaqlarda formalaşmış Sahil cığlığı (*Junicetum littoralis*) və İti cığlıq (*Junicetum acutus*) assosiasiyasından sonra gələn hərəkətli qumlu yerlərdə formalaşmış efemerlikdir. Dəniz səviyyəsindən 25 m aşağıdır. Torpaq qum və balıqqulağından ibarətdir. Burada yalnız Səhra çugundurotuna (*Alyssum desertorum*) və Sikuta durnaotuna (*Erodium cicutarium*) rast gəlinmişdir. Qeyd olunan ərazilər Yaşma və Giləzi ovçuluq təsərrüfatına aiddir. Ona görə də həm təbii amillərin, həm də ovçuluq fəaliyyəti ilə bağlı güclü təsirə məruz qalmışdır.

***Artemisetum scoparia* yarımhərəkətli qumlu səhralar.** Bu mühit hərəkətli və bərkimiş qumlu və ya quru-gilli səhralar arasında keçid təşkil edir. Dəniz səviyyəsindən 20-23 m aşağıdır. Burada əsasən *Artemisia scoparia* növünün əmələ gətirdiyi qruplaşmada 3 növ (1. İran gülümbaharotu (*Calendula persica*), 2. Yaz xaçgülü (*Senecio vernalis*) və 3. Çöl bulaqotu (*Veronica arvensis*) ) erkən yaz bitkilərinə rast gəlinmişdir. Çöl bulaqotu digər iki növlə müqayisədə tez-tes rast gəlinir. Bu tip bitkiliklərə təsir edən əsas fəaliyyət növləri ərazidə mal-qaranın həddindən artıq otarılması, yolların həddindən artıq çoxalması və külək enerjisindən istifadə məqsədilə ilk qurğuların tikilməsi ilə əlaəqdardır.

***Artemisetum lerchiana* gilli-qumlu səhralar.** Bu tip bitkilik C nümunə sahəsinin qərbində qeydə alınmışdır. Bu mühitdə yalnız *Veronica arvensis* növünə rast gəlinmişdir. Buna baxmayaraq transektlərdən biri bu mühitdə rast gəlinən erkən yaz bitkilərinin sıxlığını öyrənmək məqsədilə quraşdırılmışdır. Hər kvadrat metrdə hündürlüyü 4-8 sm olan *Artemisia lerchiana*-nın bolluğu və say hesabı ilə 30-40-a çatmasına baxmayaraq onların əmələ gətirdiyi layihə örtüyü 10%-i ötmür. Bu da onunla izah oluna bilər ki, bitkilər vegetasiyanın başlanğıcındadır. Ərazinin həddindən artıq otarılmasına baxmayaraq *Artemisis lerchiana* cücərtilərinin belə sıxlıq əmələ gətirməsi sevindirici haldır (Şəkil 4 ).

**Qariqa tipli Qaratikanlıq (*Paliuretum spina christi)* bozqırları.** Ərazi ön dağ qurşağında yerləşir və dəniz səviyyəsindən təxminən 450-500 m yüksəklikdədir. Burada əsasən *Paliurus spina christi* növünün dominantlığı ilə formalaşmış qariqa tipli bozqır bitki qruplaşmasında 6 növ (1.Alekseenko qaz soğanı (*Gagea alexeenkoana*); 2.Xanı qarğasoğanı (*Gagea chanae*); 3.Toplu süsən (*Iris reticulata*); 4. Adam zəfəranı (*Crocus adami*); 5. Sintenisi xıncalaus (*Ornithogalum sintenisii*) və 6. Eyxler danaqıran *Merendera trygyna*) erkən yaz bitkiləri qeydə alınmışdır. Ərazidə kolların diblərində yeni yarpaqlamış *Arum* cinsinə də rast gəlinmişdir. Onu da qeyd etmək lazımdır ki, *Crocus adami* və *Merendera trygyna* novlərinə fevral ayının ortalarında rast gəlinmişdir. *Iris reticulata* və *Crocus adami* orta hesabla hər kvadrat metrdə 2-3 ədəd olmaqla rast gəlinir. Ərazinin bitkiləri neftçıxarma fəaliyyəti ilə əlaqədar antropogen təsirə məruz qalmışdır. Yol kənarında kiçik bir ərazidə neft buruqlarının birinin ətrafında iki il bundan əvvəl orta hesabla hər kvadrat metrdə 1-2 ədəd *Iris reticulata*ya rast




**Şək. 2.** Rast gəlinən erkən yaz bitkilərinin fəsilələr üzrə paylanması.




**Şək. 3.** Hündürlükdən asılı olaraq erkən yaz bitkilərinin həyati formalarının paylanması. Aşağıdan yuxarı qalxdıqca bitkilərin həyati formaları uyğun olaraq birillik, soğanaqlı və çoxilliyə doğru dəyişir.

gəlindiyi halda, müşahidə aparılan dövrdə həmin ərazidə yalnız bir ədəd qeydə alınmışdır. Bu da ətraf ərazilərdə yaşayan insanlar tərəfindən *Iris reticulata* növlərinin dekorativ məqsədlər üçün toplanılması (qazılıb cıxarılması) ilə izah olunur.

**Uzunsaplaq palıdlıq (*Quergusetum longipes*) meşələri.** Bu yaşayış mühiti dəniz səviyyəsindən 700-800 m hündürlükdə Böyük Qafqazın şərqində yerləşir. Burada əsas edifikator *Quergus longipes* bitkisidir.

**Bitki qruplaşmaları.** Erkən yaz bitkilərinin rast gəlindiyi 4 ərazinin bitkilik qruplaşmaları 1 saylı cədvəldə öz əksini tapmışdır.

**Cədvəl 1.** Müxtəlif yaşayış mühitində rast gəlinən erkən yaz bitkilərinin siyahısı

| № | Yaşayış mühiti və bitki qruplaşmaları | Rast gəlinən erkən yaz bitkiləri |
|---|---|---|
| **A** | Efemerli hərəkətli qumlu səhralar | Səhra çugundur otu (*Alyssum desertorum* (Stapf.) Botsch)<br>Sikuta durnaotu (*Erodium cicutarium* (L.) L'Her.) |
| **B** | *Artemisetum scoparia* yarımhərəkətli qumlu səhralar | İran gülümbaharotu (*Calendula persica* C.A.Mey.)<br>Yaz xaçgülü (*Senecio vernalis* Waldst. & Kit.)<br>Çöl bulaqotu (Veronica arvensis L.) |
| **C** | Qariqa tipli Qaratikanlıq (*Paliuretum spina christi)* bozqırları | Aleksenko qaz soğanı (*Gagea alexeenkoana* Miscz.)<br>Xanı qarğa soğanı (*Gagea chanae* Grossh.)<br>Toplu süsən (*Iris reticulata* M.B. və ya Çerapanova görə: *Iridodictyum reticulata* M.B. Bieb.) Rodionenko<br>Adam zəfəranı (*Crocus adami* J. Gay)<br>Sintenisi xıncalaus (*Ornithogalum sintenisii* O. sintenisii Freyn.)<br>Eyxler danaqıranı (*Merendera trygyna* (Stev. ex Adams.) Stapf.) |
| **D** | Uzun saplaq palıdlıq (*Quergusetum longipes*) meşələri | Sibir zümrüdçiçəyi (*Scilla siberica* Haw.)<br>Voronov novruzçiçəyi (*Primula woronowii* Losinsk.) |

**Qeyd:** Erkən yaz bitkilərinin həyati formaları. A; B; C; və D - nümunə sahələrinin Xəritə 1-də verilmiş birkalarıdır.




**Şək. 4.** *Artemisetum lerchiana*

Ərazidə kükürdlü su ilə yanaşı az miqdarda neftlə çirklənmiş təbii bulaqlar da mövcuddur. Əraziyə marşrut zamanı qar əriyən yerlərdə yalnız *Sicilla siberica* və *Primula woronowii* növlərinin çiçəklədiyi müşahidə olunmuşdur. Ərazidən istirahət zonası kimi istifadə olunduğu üçün məişət tullantıları ilə çirkləndirilmişdir. Dağların təbii şəraiti onların coğrafi vəziyyətindən, dağ silsilələrinin istiqamətindən və hündürlüyündən sıldırımların və yamacların yerləşməsindən asılıdır. Dağlarda iqlim və bitki örtüyü düzənlikdə olduğu kimi tədricən deyil hündürlükdən asılı olaraq dəyişir. Əgər düzənlikdə (şimal yarımkürəsində) cənubdan şimala doğru 1300 km hərəkət etdikcə orta illik temperatur $6^0$C aşağı düşürsə, dağlarda isə şaquli olaraq 1 km qalxdıqda orta illik temperatur 5-$6^0$C azalır.Yüksəkliyə qalxdıqca yağıntının miqdarı və günəş enerjisi dəyişir. Gündüzlər burada torpağın səthi çox qızır, gecə isə bütün yayı tez-tez baş verən şaxtalar və hətta güclü qar düşür. Yağıntılar əsasən yüksək dağların orta hissəsinə düşür, yüksək zirvələrdə isə yağıntı çox az düşür. İqlimdən asılı olaraq dağlarda bitki örtüyü ardıcıl olaraq bir-birini əvəz edir - bu şaquli zonallıq adlandırılır. 3 yüksəklik pilləsi ayırd edilmişdir. Alçaq dağlıq, orta dağlıq pilləsi (dəniz səviyyəsindən 1000-2500 m hündürlükdə) və yüksək dağlıq (meşələrin yuxarı sərhədindən hündür ərazilər). Zonaların yüksəklik sərhədləri ərazinin en dairəsindən, dağ silsilələrinin və yamacların istiqamətindən, ümumi iqlim şəraitindən asılıdır. Alçaq dağlıq bitkiliyi qonşu düzənlik bitki zonasına uyğun gəlir. Dağlıq ərazilərin, o cümlədən öyrənilən ərazinin, bitki örtüyünün paylanmasının xarakterik xüsusiyyəti şaquli zonallıq hesab olunur. Qurşaqlar üzrə növlərin paylanmasına ərazinin dağlıq xüsusiyyətləri, yamacların ekspozisiyası, torpaq xüsusiyyətləri, torpaq sürüşmələri prosesləri, külək rejiminin yerli xüsusiyyətləri və s. mühüm təsir göstərir.

Şək. 1-dən göründüyü kimi sahil zolağının qumlu səhralarında mühit əlverişsiz olduğundan, o cümlədən istilər düşdükdə qumlu torpaqların tez quruması birillik bitkilər üçün erkən yazda qısa müddətdə yaranmış əlverişli şəraitdən istifadə

wheat. Aust. J. Agric. Res., **23:** 551-559.
**Salunke N.R., Asana R.D.** (1971) Comparative study of the development of grain in normal- and branched-ear types of wheat (*Triticum aestivum* L.). İndian J. Agric. Sci. **41:** 1050-1053.
**Singh H.B., Anderson E., Pal B.P.** (1957) Studies in the genetics of *Triticum vavilovii* Jackub. Agron. J., **49:** 4-11.
**Sun D.F., Fang J., Sun G.** (2009) Inheritance of genes controlling supernumerary spikelet in wheat line 51885. Euphytica, **167:** 173-179.
**Swaminathan M.S., Rao M.V.P.** (1961) Macro-mutations and subspecific differentiation in *Triticum*. Wheat Information Service, **13:** 9–11.

**А.Дж. Алиева, Н.Х. Аминов**

**Изучение Мейоза и Генетического Характера Наследования Нового Типа Ветвистости у Гибридных Популяций, Полученных между Линией 171ACS и Тетра- , Гексаплоидными Видами и Амфидиплоидами Пшеницы**

Линия 171ACS (AABBDD, 2n=6x=42), полученная от скрещивания *Aegilotriticale* или трехродового неполного амфидиплоида [(*Triticum durum* Desf. × *Aegilops tauschii* Coss) × *Secale cereale* L. ssp. *segetale* Zhuk.] (геномная формула AABBD/R, 2n=6x=42) с сортом мягкой пшеницы (*T. aestivum* L.) ‘Chinese Spring’ (AABBDD, 2n=6x=42) и привлеченная до сих пор в гибридизацию только с твердыми (*Triticum durum* Desf.) и мягкими (*T. aestivum* L.) сортами пшеницы, была скрещена с другими тетра- (AABB, 2n=4x=28) и гексаплоидными (AABBDD, 2n=6x=42) видами пшеницы, а также тетра- (AADD, 2n=4x=28) и гексаплоидными (AADDSS, 2n=6x=42) амфидиплоидами, несущими D-геном. У полученных гибридов $F_1$-$F_3$ были изучены процесс мейоза и наследуемость нового типа ветвистоколосости. В результате исследований обнаружено, что во втором и третьем поколениях расщерление произошло в соотношениях 3 нормальный : 1 ветвистый и 5 нормальный : 3 ветвистый, соответственно. Это показывает, что этот признак наследуется тетраплоидным видам пшеницы одним рецессивным геном и линия 171ACS является источником нового типа ветвистости не только у твердых, а также и других видов тетраплоидных пшениц. Но у гибридных популяциях, полученных между линией 171ACS и гексаплоидными видами пшеницы, а также тетра- и гексаплоидными амфидиплоидами, имеющими в геномном составе D-геном не выявлено ни одной ветвистоколосой формы, что и было раньше отмечено в гибридных популяциях 171ACS с сортами мягкой пшеницы, а это ещё раз экспериментально свидетельствовало об ингибиторном воздействии хромосом D-генома на экспрессию ветвистоколосости. Только в гибридных популяциях 171ACS × *T. vavilovii* Jakubz. и 171ACS × *T. petropavlovskyi* Udacz. et Migusch., несмотря на то, что оба родители имели в геномном составе D-геном (AABBDD), наблюдались образования ветвистоколосых форм. Конечно, в первом случае это явление объясняется ветвистоколосостью самой *T. vavilovii*, а во втором случае, можно предположить, что либо у гибридов активизировался какой-то механизм, предотварашающий ингибиторное воздействие хромосом D-генома на экспрессию ветвистоколосости, либо хромосомы D-генома элиминировались полностью или частично.

**A.J. Aliyeva, N.Kh. Aminov**

**Studying Meiosis and Genetic Character of Inheritance of the Novel Type Branching in Hybrid Populations, Derived from the Crosses between a Line 171ACS and Tetra- and Hexaploid Wheat Species and Amfidiploids**

A line 171ACS (AABBDD, 2n=6x=42), that derived from the cross between an *Aegilotriticale* or trigeneric incomplete amphidiploid [(*Triticum durum* Desf. × *Aegilops tauschii* Coss) × *Secale cereale* L. ssp. *segetale* Zhuk.] (genomic formula AABBD/R, 2n=6x=42) and a bread wheat cultivar *T. aestivum* L. ‘Chinese Spring’ (AABBDD, 2n=6x=42) and involved to hybridizations only with the durum (*Triticum durum* Desf.) and bread (*T. aestivum* L.) wheat cultivars up to date, have been crossed with the other tetra- (AABB, 2n=4x=28) and hexaploid (AABBDD, 2n=6x=42) wheat species, also tetra- (AADD, 2n=4x=28) and hexaploid (AADDSS, 2n=6x=42) wheat amphidiploids having D-genome. The meiosis and inheritance of the novel type spike branching in obtained these hybrid populations $F_1$-$F_3$ were studied. It have been found that the

segregation ratios in $F_2$ and $F_3$ took places as 3 normal : 1 branched and 5 normal : 3 branched, respectively, i.e. a novel type of branching is inherited by a single gene to the tetraploid wheats and a line 171ACS is a source of the novel type branching not only in durum wheats, also other tetraploid wheat species. But not a single branched spike observed in hybrid populations that produced by crosses of the line 171ACS with hexaploid wheat species, also tetra- and hexaploid amphidiploids having D-genome, as well as it observed before in hybrid populations derived from the crosses among a line 171ACS and bread wheat cultivars. These results once more experimentally confirmed an inhibitor effect of D-genome chromosomes on the expression of spike branching. In spite of the both parental forms had D-genome, the branched spike forms have been generated in hybrid populations 171ACS × *T. vavilovii* Jakubz. and 171ACS × *T. petropavlovskyi* Udacz. et Migusch. This fenomen in the former explains by branchiness of *T. vavilovii* itself, but in the latter might be two different explanations: either in these hybrids has been activated some mechanism which prevented an inhibitor effect of D-genome chromosomes on expression branching spike, or D-genome chromosomes were eliminated in part or in full.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 59-64 (2012)*

# Quraqlıq şəraitdə Noxud (*C. arietinum* L.) Bitkisinin Məhsuldarlığını Müəyyənləşdirən Əlamətlərin Statistik Metodlarla Təyini

**S.Ə.Həsənova[1], Ə.Ç.Məmmədov[2]**
*[1] AMEA Genetik Ehtiyatlar İnstitutu, [2]AMEA Botanika İnstitutu, Badamdar şossesi 40, Bakı AZ 1073, Azərbaycan, E-mail: amamedov_ib@yahoo.co.uk*

**Genbankda saxlanılan müxtəlif mənşəli noxud genotiplərinin məhsuldarlığına təsir edən əlamətlər tədqiq olunmuşdur. Nümunələr Genetik Ehtiyatlar İnstitutunun Abşeron elmi-tədqiqat bazasında və AzET Əkinçilik İnstitutunun Cəlilabad dayaq məntəqəsində becərilmiş, 6 məhsuldarlıq elementi (bitkinin hündürlüyü, məhsuldar gövdələrin sayı, 1 bitkidə olan paxlaların sayı, 1 bitkidə olan toxumların sayı, 1 bitkidə olan toxumların kütləsi və 100 toxumun kütləsi) üzrə struktur analizi aparılmışdır. Alınan nəticələr SPSS kompyuter proqramı vasitəsi ilə müqayisəli təhlil edilmiş və nəticələrə görə dendroqram tərtib olunmuşdur. Genotiplər arasında məhsuldarlıq komponentlərinin variasiaya dərəcəsi və onun statistik əhəmiyyəti ANOVA metodu ilə qiymətləndirilmişdir.**

***Açar sözlər:*** *Noxud, quraqlıq ,stres, tolerantlıq indeksi, stresə həssaslıq indeksi*

## GIRIŞ

Noxud - becərilmə sahəsinə və məhsuldarlığına görə dünyada üçüncü yeri tutan ərzaq bitkisidir. Bununla bərabər, noxud məhsulunun 89%-i, əkin sahəsinin isə 92%-i quru tropik ölkələrin payına düşür (Muehlbauer,F.J. and Sing K.B., 1987). Noxud iqtisadi cəhətdən səmərəli olmasına və qidalılığına görə dünya əhalisinin əsas qida məhsullarına daxildir. Noxudun tərkibi 19,5% zülal, 1,4% yağlar, 57-60% karbohidratlar, 4,8% kül və 4,9-15,59% sudan ibarətdir (Huisman J. and Van der Poel A.F.B., 19943).

Noxud bitkisinin məhsuldarlığı ilə toxumun kütləsi və bitkinin hündürlüyü arasında müsbət korrelyasiya müəyyən olunmuşdur. Eyni zamanda 100 toxumun çəkisi, paxladakı toxumların sayı, bitkidə paxlaların sayı və dəyişkənliyin fenotipik və genetik əmsalları müəyyən edilmişdir (Kumar V. And Kar C.S., 1999). Həmçinin bitkinin hündürlüyü istisna olmaqla, bütün xarakteristikaların dəyişkənlik əmsalı müəyyən olunmuşdur.

Noxud bitkisi quraqlığa davamlıdır, bu onun kök sisteminin yaxşı inkişaf etməsi və torpaqda olan rütubətdən qənaətlə istifadə etməsi ilə bağlıdır. Çiçəkləmə dövründə havanın yağıntılı olması mayalanma prosesini ləngidir, qönçələr və çiçəklər tökülür, məhsuldarlıq kəskin surətdə aşağı düşür. Bundan əlavə aşağı temperaturda askoxitoz, fuzarioz və başqa xəstəliklərə də tez tutulur (Yusufov M. , 2011).

Noxud torpağa az tələbkar olub, gillicə, şoran, qumsal torpaqlarda yaxşı məhsul verir. Noxud bitkisi qaratorpaqlı və tünd şabalıdı torpaqlarda ən yüksək məhsul verir.

Noxud quraqlığa davamlı olsa da, bəzi inkişaf fazalarında suya çox həssasdır. Ona görə vegetasiya dövründə ona bir –iki dəfə su verilməlidir. Birinci su bitki cücərməyə başladığı zaman, ikinci su isə çiçəkləmə fazasında verilməlidir. Noxud bitkisi qısagün bitkisi hesab edilir, lakin təcrübələr göstərir ki, uzungünlü vaxtlarda əkilən noxud daha tez çiçək açır (Yusufov M. , 2011).

Aparılan tətqiqat işində əsas məqsəd öyrənilən məhsuldarlıq elementləri arasındakı əlaqənin və məhsuldarlığa daha çox təsir edən əlamətlərin aydınlaşdırılması və bu əlamətlərə görə daha davamlı nümunələrin müəyyən edilməsindən ibarətdir

## MATERIAL VƏ METODLAR

Tədqiqatlar Genetik Ehtiyatlar İnstitutunun Abşeron Elmi-Tədqiqat Bazasında və AzET Əkinçilik İnstitutunun Cəlilabad dayaq məntəqəsində həyata keçirilmişdir. Tədqiqat üçün 62 noxud (*C. arietinum* L.) bitkisi istifadə edilmişdir. Nümunələrin 35-i Genbankdan, 27-si Əkinçilik İnstitutundan əldə edilmişdir. Bitkilər normal və quraqlıq şəraitlərdə becərilmişdir. Sonra nümunələrin becərildiyi hər bir sahənin ortasından götürülmüş bitkilərdə 6 məhsuldarlıq elementinə (bitkinin hündürlüyü, məhsuldar gövdələrin sayı, 1 bitkidə olan paxlaların sayı, 1 bitkidə olan toxumların sayı, 1 bitkidə olan toxumların kütləsi və 100 toxumun kütləsi) əsasən qeyd olunan əlamətlər üzrə struktur analizi aparılmışdır. Klaster analizi SPSS kompyuter proqramı vasitəsilə həyata keçirilmişdir (Sneath P.H.A. and Sokal R.R., 1973).

Quraqlığa davamlılıq, stresə həssaslıq və tolerantlıq indekslərinə görə hesablanmış,

korrelyasiya analizləri həyata keçirilmişdir. Quraqlıq intensivliyi (D) aşağıdakı kimi hesablanmışdır:

$$D = 1 - X / Xp$$

$X$ - bütün genotiplərin quraq şəraitində, $Xp$ – isə normal şəraitdə məhsuldarlığıdır.

Tolerantlıq indeksi:

$$TOL = y_p - y;$$

Stresə həssaslıq indeksi:

$$SHI = \frac{1 - y / y_p}{D}$$

$y$ - fərdi genotiplərin quraq, $y_p$ – isə normal şəraitdə məhsuldarlığıdır. TOL və SHİ-nin aşağı qiyməti quraqlığa yüksək davamlılıqla ekvivalentdir (Fischer R.A. and Maurer R.,1973)

## NƏTICƏLƏR VƏ ONLARIN MÜZAKIRƏSI

Normal və quraqlıq şəraitində becərilən noxud bitkilərindən götürülən nümunələr statistik metodların köməyi ilə analiz edilmişdir. Həm normal (cədvəl 2), həm də quraqlıq (cədvəl 3) şəraitində öyrənilən genotiplərdə tədqiq olunan məhsuldarlıq elementlərində yüksək variasiya müşahidə olunmuşdur. Abşeron şəraitində bitkinin hündürlüyü, bir bitkidə olan paxlanın sayı (35,0-143), bir bitkidə olan toxumların sayında (68,0-235,8) bu fərqlilik daha yüksək olmuşdur (cədvəl 4). Quraqlıq şəraitində isə bitkinin hündürlüyü (40,4-73,2) bir bitkidə olan paxlanın sayı (11-79,8) bir bitkidə olan toxumların sayı (15,4-81,48) və bir bitkidə olan toxumların kütləsində (4,7-87,5) kəskin azalma müşahidə olunmuşdur (cədvəl 3). Quraqlıq stresinin bitkilərə təsiri bir bitkidə olan paxlaların sayında daha qabarıq özünü göstərir. Abşeron şəraitində bu say 35,0-143,0 olduğu halda, Cəlilabad şəraitində 11-79,8 olmuşdur. 100 toxumun kütləsində az fərq müşahidə olunmuşdur, belə ki, quraqlıq şəraitində 17,8-45,0 q, normal şəraitdə isə 15,5-45,5 q arasında dəyişmişdir.

Cəlilabad şəraitində becərilən noxud bitkisində 1 bitkidə toxumların kütləsi 11.4-81.48, 1 bitkidə toxumların sayı 17,8-45,0 olduğu halda, Abşeron şəraitində becərilən noxud bitkisində1 bitkidə toxumun kütləsi 68-235.8, 1 bitkidə toxumların sayı 15,5-45,5 olmuşdur. Bu da onunla əlaqədardır ki, toxumların sayı çox olan bitkilərdə toxumlar kiçik, toxumların sayı az olan bitkilərdə isə toxumlar iri olmuşdur.

Stresə həssaslıq indeksi (S) hesablanmışdır və müəyyən olunmuşdur ki, bəzi nümunələrdə stresə həssaslıq indeksi aşağı olduğuna görə quraqlığa davamlı nümunələr hesab edilə bilər.

Tolerantlıq indeksi əsasında klaster analizi nümunələri hər biri iki şaxədən ibarət olan iki əsas qrupda cəmləşdirmişdir (şəkil 1). Dendroqrammadan göründüyü kimi 1; 3; 4; 5; 9; 11; 12; 14; 15; 16; 18; 19; 20; 22; 24; 27; 30; 32; 33; 36; 41; 42; 50; 53; 54 nömrəli nümunələr bir qrupda birləşmişdir. Tolerantlıq indeksinin qiymətlərinə nəzər salsaq ,bu qrupda olan genotiplərin aşağı qiymətlər aldığını görərik. Ona görə də bu nümunələr quraqlığa davamlı nümunələr kimi qiymətləndirilə bilər. Həmçinin 1 saylı cədvəldən də göründüyü kimi bu nümunələrdə Stresə həssaslıq indeksi də aşağı qiymətlər almışdır.

III qrupda toplanmış 5 nümunədə (30; 62; 28; 49; 60) isə tolerantlıq indeksinin qiymətləri yüksəkdir. Bu da həmin nümunələrin davamsız olduğunu göstərir. 30 nömrəli nümunə Naxçıvan, 28; 49; 60; 62; nömrəli nümunələr isə Suriya mənşəlidir.

**Cədvəl 1.** Noxud nümunələrinin stresə həssaslıq indeksi

| № | Mənşəyi | SHİ | № | Mənşəyi | SHİ | № | Mənşəyi | SHİ |
|---|---|---|---|---|---|---|---|---|
| 1 | Lənkəran 1 | 0.86 | 22 | Filipp 97-24 | 0.38 | 43 | Filipp 03-48 | 0.84 |
| 2 | Cəlilabad 11 | 0.89 | 223 | Filipp 03-22 | 0.73 | 44 | Filipp 03-71 | 1.18 |
| 3 | Cəlilabad 55 | 0.29 | 24 | Bakı 30 | 1.11 | 45 | Filipp 04-35 | 1.07 |
| 4 | Cəlilabad 50 | 0.88 | 25 | Abşeron 34 | 0.99 | 46 | Filipp 03-22 | 1.19 |
| 5 | Ağdaş 18 | 0.47 | 26 | Abşeron 35 | 1.18 | 47 | Filipp 03-77 | 1.16 |
| 6 | Şamaxı 25 | 1.13 | 27 | Filipp 22-04 | 1.28 | 48 | Filipp 03-27 | 1.18 |
| 7 | Yardımlı 28 | 1.16 | 28 | Filipp 23-04 | 1.01 | 49 | Filipp 04-4 | 1.26 |
| 8 | Yardımlı 27 | 0.72 | 29 | Filipp 02-88 | 0.86 | 50 | Filipp 04-16 | 1.34 |
| 9 | Masallı 30 | 0.34 | 30 | Filipp 48 | 1.26 | 51 | Filipp 06-7c | 1.32 |
| 10 | Masallı 51 | 1.12 | 31 | Ordubad -41 | 1.12 | 52 | Filipp 06-89c | 0.94 |
| 11 | Biləsuvar 58 | 0.59 | 32 | Sabirabad 59 | 1.12 | 53 | Filipp 32-79 | 1.10 |
| 12 | Lerik 33 | 0.46 | 33 | Filipp 00-19 | 1.09 | 54 | Filipp 05-19c | 1.21 |
| 13 | Ağstafa 35 | 0.94 | 34 | Filipp 97-32 | 1.16 | 55 | Filipp 06-144c | 1.25 |
| 14 | Ağstafa 36 | 0.16 | 35 | Sultan98-178 | 1.06 | 56 | Filipp 05-169c | 1.12 |
| 15 | Ağstafa 42 | 0.66 | 36 | Filipp 03-93 | 1.29 | 57 | Filipp 06-28c | 0.91 |
| 16 | Lənkəran 2 | 0.58 | 37 | TH 1 04 | 0.81 | 58 | Filipp 06-8c | 1.29 |
| 17 | Ordubad 39 | 1.06 | 38 | Filipp 03-34 | 1.26 | 59 | Filipp 06-13 | 1.15 |
| 18 | Ordubad 41 | 1.49 | 39 | Filipp 03-17 | 1.98 | 60 | Filipp 06-61c | 1.28 |
| 19 | Qusar 43 | 0.48 | 40 | Filipp 04-38 | 1.22 | 61 | Filipp 06-18c | 1.09 |
| 20 | Qusar 44 | | 41 | Filipp 03-36 | 1.10 | 62 | Filipp 06-33c | 1.26 |
| 21 | Filipp 06-161c | | 42 | Nərmin 57 | | | | |

**Cədvəl 2.** Tədqiq edilən məhsuldarlıq əlamətlərinin tolerantlıq indeksləri

| № | Noxud bitkisinin genotipləri | Paxlanın sayına görə tolerantlıq indeksi | 100 toxumun kütləsinə görə tolerantlıq indeksi | 1 bitkidə toxumların kütləsinə görə tolerantlıq indeksi |
|---|---|---|---|---|
| 1 | Lənkəran1 | 81 | 14,2 | 3,84 |
| 2 | Cəlilabad11 | 110,4 | 4,0 | 23,46 |
| 3 | Cəlilabad55 | 64,8 | 1,7 | 18,85 |
| 4 | Cəlilabad50 | 41,6 | 1,4 | 6,88 |
| 5 | Ağdaş18 | 21,8 | 10,7 | 8,24 |
| 6 | Şamaxı25 | 43,6 | 6,8 | 16,35 |
| 7 | Yardımlı28 | 56,4 | 1,3 | 16,21 |
| 8 | Yardımlı27 | 12,2 | 1,9 | 5,5 |
| 9 | Masallı30 | -3 | 0,9 | -1,6 |
| 10 | Masallı51 | 85,8 | 9,3 | 18,65 |
| 11 | Biləsuvar58 | 43,2 | 13,8 | 0,68 |
| 12 | Lerik33 | 67,4 | 11,5 | 3,88 |
| 13 | Ağstafa35 | 111 | 13,8 | 18,32 |
| 14 | Ağstafa36 | 37,2 | 6,1 | 2,1 |
| 15 | Ağstafa42 | 9,2 | 2,6 | 1,9 |
| 16 | Lənkəran2 | 37,4 | 2,0 | 8,5 |
| 17 | Ordubad39 | 56,4 | 4,6 | 13,1 |
| 18 | Ordubad41 | -9,8 | 18,9 | -10,58 |
| 19 | Qusar43 | 16,4 | 8,0 | 0,5 |
| 20 | Qusar44 | 13,6 | 5,8 | 5,3 |
| 21 | Filipp 97-24 | 32,0 | 13,5 | 17,3 |
| 22 | Filipp 03-22 | 75,4 | 7,7 | 7,7 |
| 23 | Bakı 30 | 58.2 | 13,0 | 16,2 |
| 24 | Abşeron34 | 65,0 | 6,3 | 3,6 |
| 25 | Abşeron35 | 17,0 | 5,0 | 21,0 |
| 26 | Filipp22-04 | 74,4 | 4,6 | 11,8 |
| 27 | Filipp 23-04 | 53,0 | 10,5 | 6,5 |
| 28 | Filipp 02-88 | 40,0 | 16,0 | 30,9 |
| 29 | Filipp-48 | 56,2 | 17,1 | 17,8 |
| 30 | Ordubad47 | 57,6 | 2,4 | 32,7 |
| 31 | Sabirabad59 | 91,6 | 1,0 | 12,1 |
| 32 | Filipp00-19 | 39,8 | 2,9 | 10,4 |
| 33 | Filipp97-32 | 38,2 | 1,7 | 8,6 |
| 34 | Sultan98-178 | 28,0 | 9,9 | 21,2 |
| 35 | Filipp03-93 | 61,4 | 6,4 | 4,1 |
| 36 | TH 1-04 | 16,4 | 9,0 | 20,6 |
| 37 | Filipp03-34 | 46,Ş0 | 11,5 | 22,5 |
| 38 | Filipp03-17 | 59,8 | 8,4 | 22,5 |
| 39 | Filipp04-38 | 22,4 | 16,9 | 13,0 |
| 40 | Filipp03-36 | 44,0 | 5,1 | 11,9 |
| 41 | Filipp03-48 | 20,1 | 2,5 | 7,1 |
| 42 | Filipp03-71 | 18,4 | 3,0 | 6,2 |
| 43 | Filipp04-35 | 48,0 | 0,2 | 13,8 |
| 44 | Filipp03-22 | 62,2 | 8,7 | 20,0 |
| 45 | Filipp03-77 | 63,0 | 5,2 | 20,7 |
| 46 | Filipp03-27 | 60,4 | 4,9 | 22,6 |
| 47 | Filipp04-4 | 75,6 | 8,0 | 24,2 |
| 48 | Filipp04-16 | 58,2 | 10,6 | 23,8 |
| 49 | Filipp06-7c | 62,2 | 14,3 | 30,9 |
| 50 | Filipp06-89c | 38,2 | 8,8 | 6,2 |
| 51 | Filipp32-79 | 47,8 | 1,6 | 14,4 |
| 52 | Filipp05-19c | 55,6 | 2,0 | 13,9 |
| 53 | Filipp06-144c | 53,4 | 0,3 | 18,5 |
| 54 | Filipp05-169c | 46,0 | 2,1 | 14,6 |
| 55 | Filipp06-28c | 54,4 | 6,0 | 7,5 |
| 56 | Filipp06-8c | 74,8 | 0,8 | 24,4 |
| 57 | Filipp06-133c | 75,8 | 5,8 | 26,1 |
| 58 | Filipp06-61c | 67,2 | 1,4 | 21,0 |
| 59 | Filipp06-18c | 43,4 | 1,0 | 24,2 |
| 60 | Filipp06-33c | 52,4 | 1,8 | 30,2 |
| 61 | Filipp06-161c | 31,0 | 11,2 | 9,3 |
| 62 | Nərmin57 | 66,0 | 4,8 | 32,9 |




**Şəkil 1**. Bir noxud bitkisində olan toxumların kütləsinə görə hesablanmış tolerantlıq indeksi əsasında qurulmuş dendroqram

**Cədvəl 3.** Cəlilabad şəraitində səpilmiş noxud nümunələrinin bəzi məhsuldarlıq elementlərindəki variasiya dərəcəsi

| Əlamətlər | min | max | orta qiymət |
|---|---|---|---|
| Hündürlük | 40,4 | 73,2 | 58,4 |
| Məhsuldar gövdələrin sayı | 2 | 4,2 | 3,1 |
| 1bitkidə paxlanın sayı | 11 | 79,8 | 45 |
| 1bitkidə toxumun kütləsi | 11,4 | 81,48 | 1,5 |
| 100 toxumun kütləsi | 4,7 | 87,5 | 46,1 |
| 1bitkidə toxumun sayı | 17,8 | 45 | 40,3 |

**Cədvəl 4.** Abşeron şəraitində səpilmiş noxud nümunələrinin bəzi məhsuldarlıq elementlərindəki variasiya dərəcəsi

| Əlamətlər | min | max | orta qiymət |
|---|---|---|---|
| Hündürlük | 42,6 | 74,2 | 79,7 |
| Məhsuldar gövdələrin sayı | 2 | 8 | 5 |
| 1bitkidə paxlanın sayı | 35 | 143 | 106,5 |
| 1bitkidə toxumun kütləsi | 68 | 235,8 | 185,9 |
| 100 toxumun kütləsi | 8,29 | 62,0 | 39,29 |
| 1bitkidə toxumun sayı | 15,5 | 45,5 | 38,25 |

Dördüncü qrupda yerləşən 18 nömrəli nümunə (Ordubad 41) isə ən davamlı nümunə kimi (-10.58) qiymətləndirilmişdir. Bu nümunə də Naxçıvan mənşəlidir.

Quraqlığa davamlı nümunələr kimi qiymətləndirilmış genotiplər seleksiyada daha davamlı yüksək məhsuldar sortların yaradılmasında başlanğıc material kimi, həm də Azərbaycanın dəmyə şəraiti olan ərazilərdə fermerlər tərəfindən becərmək üçün tövsiyə olunur.

## ƏDƏBIYYAT

**Huisman J., Van der Poel A.F.B.** (1994) Aspects of the Nutritional Quality and Use of cool Season Food Legumes in Animal feed. Pp. 53-76

**Kumar V., Kar C.S., Sharma P. C., Kumar V.** (1999) Variability correlation and path coefficient analysis in chickpea (*Cicer arietinum* L.) Environment and Ecol., **17(4):** 936-939.

**Muehlbauer F.J., Sing K.B.** (1987). Genetics of chickpea. Pp. 99-126.

**Sial P., Mishra P.K., Patnaik R. K.** (2003). Studies on Genetic variability, heritability and genetic advance in chickpea. (*Cicer arietinum* L.) Environment and Ecology, 21(1): 210-213.

**Sneath P.H.A, Sokal R.R.** (1973) Numerical taxonom. Freeman and Company: San Francisco.

**Tripathi A.K.** (1998) Variability analysis in chickpea .Adv. Pl. Sci., **11 (2):** 291-292.

**Wahid, M.A., Ahmed R.** (1999) Genetic variability, correlation studies and their implication in selection of high yielding genotypes in chickpea (*Cicer arietinum* L.). Sarhad J. Agri., **15(1):** 25-28.

**Yusufov M.** (2011) Bitkiçilik. Bakı: 368 s.

**Fischer R.A., Maurer R.** Drought resistance in spring wheat cultivars. I. Grain yield responses // Austr. J. Agric. Res., 1978, **29:** 897-912

**С. К. Гасанова, А.Ч. Маммадов**

### Определение Статистическими Методами Признаков, Влияющих на Продуктивность Растений Нута (*C. arietinum*) в условиях засухи

Были исследованы признаки, влияющие на урожайность 62 образцов нута разного происхождения, содержащихся в Генбанке. Образцы были выращены в Апшеронской научно-исследователской базе Института Генетических Ресурсов и Джалилабадской базе Научно-Исследователского Института Земледелия. Проводились структурные анализы по 6 элементам урожайности (высота растений, число продуктивных стеблей, количество фасоль на одном растении, количество семян на одном растении и масса 100 семян). Полученные результаты сравнительно анализированы компьютерной программой SPSS и по данным была построена дендрограмма. Проведена оценка уровня вариации компонентов продуктивности между генотипами и статистическая значимость с помощью Anova – метода.

**S.Q. Qasanova, A.Ch. Mammadov**

**Determination of Traits Influencing Chickpea (*C. arietinum*) Productivity Using Statistic Methods Under Drought**

Traits influencing the productivity were studied on 62 chickpea accessions of diverse origin from National Genebank. Accessions were sown in Absheron Scientific Experimental station of Genetic Resources Institute and Jalalabad station of Azerbaijan Scientific Agriculture Research Institute and were analyzed based on 6 yield components (plant height, number of productive branches, number of pods per plant, number of seeds per plant and 100 kernel weight). Results were comparatively analyzed and the dendrogram was created based on these results.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 65-68 (2012)*

# Specifying main characteristics of five Iranian local cultivars of almond (*Prunus dulcis* Mill.)

**H. Rahnemoun**
*Baku State University, Academic Zahid Khalilov street 23, Baku AZ-1073/1,Azerbaijan,*
E-mail: hr482002@yahoo.com

**For introducing five Iranian local cultivars of almond *Sahand*, *Shokufe*, *Azer*, *Yalda* and *Monagga*, a primary study was carried out on some major characteristics of them. *Sahand* cv. with 9100 G.D.H. (Growth Degree Hours) heating and 384 C.U. (Chilling Unit) chilling requirements operated as the latest bloom (middle April). Also, *Shokufe* cv. as earlier ripen (late August), *Azer* cv. as more productive (654 kg/h kernel) and easier harvest and *Monagga* cv. as earlier bloom (middle March) were specified in this study. Variance analysis of kernel and shell dimension and weight, the ratio of kernel/shell weight, number of spurs on branches and flower bud number in spurs showed the significant differences among cultivars (P≤5%) whereas differences in amount of carbohydrates, proteins and lipids of kernels were non-significant.**
***Keywords:*** *Almond cultivars, chilling, heating, spur, kernel, shell*

## INTRODUCTION

Based on the statistics of F.A.O organization (http://www.fao.org/faostat), Iran produces about 110,000 t/year almond crops in over 172,000 h areas and in this respect is the fourth country in the world (figure 1).

Almond is one of the oldest crops in Iran and this country with its nearby regions are counted as diversity and development centers for different almond species (Ladinsky, 1999; Gahraman, 2002; Chaichi, 2005). Regarding to this matter, studying and selecting promising genotypes among native almond population has been followed in the national breeding program of almond in Iran from fifty years ago.




**Fig. 1.** Iran's share of global production of almond

The main aims of this program are achievement to high productivity, high kernel quality, shell softness, late blooming date and toleration against environmental stresses. Although, many commercial cultivars of almond including: Texas, Ferragnes, Nonpareil, Marcona, Masbouvera, etc. (Westwood, 2009) and tolerant rootstocks such as GF677, GF557, Hansen 536, Hansen 2168 (Kester and Asay, 1986), Alnem 1, Alnem 88, Alnem 201, etc. (Kochban and Spiegel-Roy, 1976) have already been introduced in the world but some of them are not adapted perfectly with Iran's conditions. On the other hand, at present many local cultivars have been planted in extensive areas of different regions of Iran that mostly are early bloom and so lose all or portion of their crop due to late frost damage. Therefore, investigations to obtaining new superior cultivars with mentioned characteristics above have been followed continuously up to now.

## MATERIALS AND METHODS

This study was carried out on five local cultivars of almond named; *Sahand*, *Shokufe*, *Yalda*, *Azer*, *Monagga* and *Nonpareil* cv. (as control) at the *Sahand horticultural research station* located in 25 km of southwest of Tabriz with 37º,55´ latitude, 45º,57´ longitude and 1350 m altitude. The studied characteristics included; full blooming date, easy harvesting, the spur numbers on each meter of yielded branches, flower bud number in each spur, ripening date, tree chilling requirement, location of flower buds, heat requirement for opening flower buds, suitable pollenizer, vigor and form of tree, shell softness, shell and kernel dimensions and weights, double kernel percentage, the ratio of kernel/shell weights and the amount of lipids, proteins and carbohydrates of kernels. The characteristics of shell softness, tree form and vigor, easy harvesting were ranked according to *I.B.P.G.R.* (*International board for plant resources*) descriptors, tree chilling and heating requirements with *Spark* method (Spark, 1993) and others were recorded based on statistical methods.

## RESULTS AND DISCUSSION

The tables 1 and 2 show the results of recorded attributes in relation with tree and fruit of studied almond cultivars respectively. *Sahand* cv. was later bloom than others (middle April) and so produced economic crop under late spring frost conditions. Also, recording chilling and heating requirements of each cultivar showed this cultivar had the highest rate of both kinds. Although, *Shokufe* cv. had 200 C.U. chilling and 5700 G.D.H. heating requirements respectively and it seemed to be an early or middle bloom cultivar, but it operated as a late bloom. That might be resulted from the slow temp reaction of flower buds or late beginning of physiological dormancy and or both of them. However, *Monagga* cv. as a typical early bloom cultivar had less dormancy period than other cultivars conformity with its low chilling requirement. Also, was not observed significant differences among the full blooming date of *Yalda*, *Azer* and *Nonpareil* cvs. and the flowers of them were opened almost in the same time (early April).

**Table 1.** Tree characteristics of five Iranian local almond cultivars

| Characteristics | Cultivars | | | | | |
|---|---|---|---|---|---|---|
| | ***Sahand*** | ***Yalda*** | ***Shokufe*** | ***Azer*** | ***Monagga*** | ***Nonpareil (Cont.)*** |
| **Full blooming date** | Middle April | Early April | Middle April | Early April | Middle March | Early April |
| **Ripening date** | Middle September | Middle September | Late August | Early September | Late August | Late August |
| **Easy harvesting** | Intermediate | Relatively low | Low | Relatively high | Intermediate | Intermediate |
| **Tree vigor & form** | Strong, Upright | Strong, Spreading | Strong, Spreading | Intermediate, Spreading | Intermediate, Spreading | Intermediate, Spreading |
| **Pollenizer** | Ferragnes, Shokufe | Azer | Ferragnes, Sahand | Nonpareil, Shokufe | Mamae, Sefid | Yalda, Azer |
| **Location of flower buds** | Mostly on spurs | Mixed | Mostly on shoots | Mixed | Mixed | Mostly on shoots |
| **Flower bud number in spur** | 4.60 a | 3.99 ab | 2.58 c | 3.70 ab | 3.60 b | 3.55 b |
| **Spur number on branch** | 46.34 a | 37.92 ab | 25.67 b | 38.50 a | 40.33 a | 31.01 b |
| **Chilling req. (C.U)** | 384 | 220 | 200 | 329 | 50 | 300 |
| **Heating req.(G.D.H)** | 9100 | 5700 | 5700 | 6500 | 5800 | 7300 |

**Table 2.** Fruit characteristics of five Iranian local almond cultivars

| Characteristics | | Cultivars | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | ***Sahand*** | ***Yalda*** | ***Shokufe*** | ***Azer*** | ***Monagga*** | ***Nonpareil (Cont.)*** |
| **Shell softness** | | Hard | Soft | Soft | Intermediate | Soft | Soft |
| **Shell dimension (mm)** | **Length** | 24.2 | 18.3 | 17.8 | 20.0 | 18.1 | 17.7 |
| | **Width** | 35.0 | 36.9 | 25.4 | 28.7 | 28.6 | 32.0 |
| **Shell weight (g)** | | 4.25 | 1.96 | 1.32 | 2.51 | 1.64 | 1.62 |
| **Kernel dimension (mm)** | **Length** | 24.2 | 27.8 | 20.0 | 23.2 | 22.2 | 25.0 |
| | **Width** | 15.5 | 11.2 | 11.0 | 13.2 | 12.1 | 12.2 |
| | **Thickness** | 7.80 | 7.20 | 7.65 | 8.42 | 8.54 | 7.55 |
| **Kernel weight (g)** | | 1.18 a | 1.07ab | 0.78 b | 1.01 ab | 0.98 b | 1.12 a |
| **Kernel /Shell (%)** | | 27 | 55 | 58 | 43 | 60 | 68 |
| **Double kernels (%)** | | 16 | 3 | - | 4 | 2 | 10 |
| **Lipids (%)** | | 51.9 | 52.4 | 58.2 | 60.1 | 56.7 | 53.8 |
| **Proteins (%)** | | 21.9 | 20.8 | 22.5 | 20.1 | 20.2 | 18.9 |
| **Carbohydrates (%)** | | 19.8 | 20.1 | 19.2 | 19.6 | 20.7 | 20.4 |




**Fig. 2.** Yielding rate of Iranian almond cultivars.

Pull off force of fruits was recorded for evaluation of easy harvesting and results showed that *Azer* cv. with -11.2 N harvested easier whereas *Shokufe* cv. with -22.6 N was harder from this viewpoint. This parameter may be important for adjustment of shakers in mechanical harvesting.

So, as the studied cultivars were incompatible, it became necessary to determinate some suitable pollenizers for them. It was carried out after isolation of at least 500 flower buds from each one and inoculation of them with some cultivars pollen. In this way, the best compatible pollen was specified by counting formed fruits at the end of season.

All experimental trees have been grafted on native almond seedlings and it may be considerable about obtained data for the characteristic of tree vigor and form. Also, statistical analysis of spur number on branches, flower bud number in each spur, shell and kernel sizes and their weights showed the significant differences among cultivars at 5% probability level (tables 1, 2). However, differences among cultivars were not significant in relation with the amount of lipids, proteins and carbohydrates of kernels.

The comparison of studied cultivars performance with *Nonpareil* cv. revealed that they could be to use for commercial aims. The difference of yielding rate (kernel) of *Azer* and *Yalda* cvs. with control was non-significant (figure 2). Although, *Sahand* cv. produced lower kernel but based on regional observations, it had the best acclimation with Azerbaijan conditions and its toleration against late frost damage and stable productivity generally compensated differences of yielding.

## REFERENCES

**Chaichi S.** (2005) An analysis on almond breeding in Iran. IV Int. Symp. Pistachios and almond. Iran: Tehran, p. 2

**Gahraman A.** (2002) Flora of Iran. Tehran: Research Institute of Forests and Rangelands of Iran Publications, 1123 p.

http://www.fao.org/faostat - Database Results, 2009.

**Kester D., Asay R.N.** (1986) 'Hansen 2168' and 'Hansen 536' two new hybrid rootstocks. Hort. Sci., **2(21):** 331-332.

**Kochbah J., Spiegel-Roy P.** (1976) 'Alnem 1', 'Alnem 88' and 'Alnem 201' almonds: Nematode-resistant rootstock seed sources. Hort. Sci., **11(3):** 720.

**Ladsinsky G.** (1999) On the origin of almond. Genetic Resour. Crop Eval., **42(2):** 143-147.

**Spark S.D.** (1993) Chilling and heating model for pecan bud-break. J. Amer. Soc. Hort. Sci., **1(118):** 29-35.

**Stebbins R.L.** (1981) A review of rootstocks for stone fruits. Ore. Hort. Soc. Ann. Rep., p. 23-30

**Westwood M.N.** (2009) Temperate-zone pomology, physiology and culture. New York: Timber Press, USA, 536 p.

**H. Rahnemoun**

**İranın Beş Yerli Badam (*Prunus dulcis* Mill.) Sortunun Əsas Xüsusiyyətlərinin Müəyyənləşdirməsi**

**Xulasə**

Tədqiqatlar İranın *Səhənd*, *Azər*, *Şukufə*, *Yəlda* və *Monəqqa* adlı beş yerli badam sortlarının istehsala buraxılması üçün onların əsas xüsusiyyətləri üzərində aparılmışdır. Əldə edilmiş nəticələrə əsasən, *Səhənd* sortu 9100 G.D.H (İnkişaf dərəcəsi saatı) istilik və 384 C.U (soyuqluq vahidi) soyuqluq tələb etməklə özünü ən gec çiçəkləyən (Aprelin ortasında) sort kimi göstərmişdir. Həmçinin *Şukufə* sortu ən tez yetişən sort (Avqustun sonunda), *Azər* sortu məhsuldar (654 kq/ha) və asan yığılan sort və *Monəqqa* sortu ən tez çiçəkləyən sort (Martın ortasında) kimi göstərilmişdir. Hesablanmış variasiyaların analizinə görə, qeyd olunan sortların arasında dənə və çəyirdəyin ölçüsü və çəkisi, budaqların uzərindəki tumurcuq, habelə onların içində yerləşən çiçək gönçələrinin sayı kifayət gədər fərqli olmuşdur ($p \leq 0.05$). Lakin, dənədə karbohidratların, zülalların və lipidlərin orta qiymətlərinin arasında ciddi fərq görünməmişdir.

**Определение Основных Особенностей Пяти Иранских Местных Сортов Миндаля (Prunus Dulcis Mill.)**

Исследования были проведены на основе основных особенностей пяти иранских местных сортов миндаля Саханд, Шукуфе, Азер, Ялда и Монагга для выпуска на производство. Основываясь на полученные результаты сорт Саханд с 9100 G.D.H. (часы степени роста) к теплу и 384 C.U (показатель холода единица охлаждения) к холоду требовательный показал себя как сорт с самым поздним цветением (в середине апреля). Кроме того, сорт Шукуфе показан как самый раносозревающий (в конце августа), сорт Азер как продуктивный (654 кг/ч ядра) и легко собираемый и сорт Монагга как самый раноцветущий (в середине марта). По анализу рассчитанных вариаций размер и масса семени и косточки, соотношение веса семени / косточки, число расположенных на ветках почек и число цветочных бутонов в почках среди указанных сортов оказались достаточно различными ($P \leq 5\%$), в то время как различия в количестве углеводов, белков и липидов в семени были незначительным.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 69-74 (2012)*

# Naxçıvan Muxtar Respublikasının Arazboyu Düzənliklərində Səhra və Yarımsəhra Fitosenozlarının Tədqiqi

**F.X. Nəbiyeva**
*AMEA Naxçıvan Bölməsi, Bioresurslar İnstitutu, Babək pr. 10, AZ 7000, Naxçıvan,*
*E-mail:* fatmakhanym_58@mail.ru

**Məqalədə müasir səhra senozlarının kserofit bitkilərin lokal biotiplərinin formalaşmasına təsiri və rolundan bəhs edilir. Müasir səhra senozlarında əlverişsiz şəraitə - quraqlığa, şorlaşmaya, küləklə sovrulmaya və digər bu kimi məhvedici amillərə qarşı uyğunlaşma əlaməti olaraq kserofit bitkilərin lokal biotipləri inkişaf edərək formalaşır. İlk dəfə olaraq, Arazboyu ərazilərin Sədərək, Şərur, Böyükdüz, Gülüstan düzənliklərində lokallaşma prosesi elmi əsaslarla öyrənilmişdir. Buradakı səhra və yarımsəhralarda 20300 lokal biotipin olduğu müəyyənləşdirilmiş, onların növ tərkibi, fitosenoloji quruluşu və bioloji rolu tədqiq olunmuşdur.**

***Açar sözlər:*** *lokal biotip, mikroiqlim, səhra, yarımsəhra, fitosenoz, kserofit, halofit*

## GİRİŞ

Arazboyu düzənliklər Naxçıvan Muxtar Respublikası ərazisinin 32%-ni təşkil edir. Bu ərazi Dərələyəz və Zəngəzur dağlarının meridian istiqamətində yaranan qolları və ya yüksəklikləri vasitəsilə Sədərək, Şərur, Böyükdüz, Naxçıvan, Gülüstan, Dəstə, Ordubad maili düzənliklərinə ayrılır. Bu düzənliklər qurşağı dəniz səthindən 600-1000 m-dək olan yüksəklikləri əhatə edir. Onlar səhra və yarımsəhra ekosistemlərinə məxsus fitosenozlardan ibarət olmaqla, qış otlaqları kimi istifadə olunurlar. Bu ekossistemlərin indikatorları, dominant, subdominant və edifikatorları tipik kserofit, halofit, həmçinin halokserofit bitkilərdir. Burada baş verən bütün dəyişikliklər səhralaşma prosesində və arid (quru) ərazilərin təbii komplekslərinin dəyişilməsində özünü göstərir. Səhra və yarımsəhralarda yağıntıların, rütubətin azlığı, əksinə temperaturun, buxarlanmanın çox olması bir qrup bitkilərin yaşayışını çətinləşdirir. Xüsusilə, qısa ömürlü efemer və efemeroidlərin inkişafı hər şeydən əvvəl mikroiqlim şəraitinin dəyişməsi ilə bağlıdır. Təbii olaraq, mikroiqlim şəraitinin məhəlli dəyişilməsi məhz yerli fiziki-coğrafi komponentlərin və landşaft komplekslərinin dəyişməsindən asılıdır. Kserofitləşmə, bozqırlaşma posesləri meşələrin, kolluqların qırılması, yarımsəhralarda, quraq çöllərdə bitki örtüyünün dəyişilməsi (suvarılan əkin, bağ, üzüm plantasiyalarının, yaşayış məntəqələrinin salınması və s.), səth albedosunun, radiasiya balansının, termik şəraitin, nisbi rütubətlənmənin və s. dəyişilməsində əks olunur. Bu isə bütövlükdə aridliyi daha da artırır, torpaq səthi kəskin quruyur, sel prosesləri, deflyasiya güclənir, nəticədə səhralaşma prosesi fəallaşır.

Regionun bitki növləri əsasən heyvandarlığın təbii yem bazası olan qış və yay otlaqlarında, biçənəklərdə, kənd ətrafı örüşlərdə yayılmışdır. İntensiv və normadan qat-qat artıq mal-qara tərəfindən otarılan bu sahələrdə otarma texnikası və qaydalarına ciddi əməl olunmadığından ayrı-ayrı bitkilik tipləpində yem, qida, dərman əhəmiyyətli bitkilər, həmçinin nadir və relikt növlər sayca azalıb sıradan çıxır, onların yerini isə az əhəmiyyətli alaq, kosmopolit, adventiv bitkilər əvəz edir. Nəticədə ot örtüyü seyrəlmiş sahələrdə torpaq eroziyası, deqradasiyası, təkrar şorlaşması burada səhralaşma prosesinin güclənməsinə gətirib çıxarır. Səhra fitosenozlarının müxtəlif sahələrində kserofit bitkilərin talalar (ləkələr) şəklində kiçik qruplaşmaları, yaxud lokal biotipləri yaranır. Lokal biotiplərin botaniki tərkibi halofit və halokserofit bitki növlərindən təşkil olunur. Burada səhra fraqmentlərinin şoranlı gilli-takırlı və çınqıllı gipsləşmiş tiplərinə də rast gəlinir. Onların yaranmasına, inkişafına quraq iqlim şəraitində otlaqlardan səmərəli istifadə olunmaması əsas rol oynayır. Xüsusilə, kserofit səhra fitosenozlarında intensiv otarılma nəticəsində ot örtüyü dağılır və ərazi çılpaqlaşır. Bitki örtüyü seyrəkləşmiş torpaqlar, öz növbəsində intensiv yuyulur və şorlaşır.

Son illər duzlaşmış sahələrdə çox sayda yeni halofit bitkilərin aşkar edilməsi, səhra landşaftının intensiv inkişaf etməklə öz tərkibini adventiv və yerli bitki komponentləri ilə zənginləşdirdiyini təsdiq edir. Halofit növlər səhra bitkiliyində edifikator və dominant kimi iştirak etməklə fitosenozun əsas yem kütləsini təşkil edirlər (Zalibekov 1990; Prilipko, 1939; Sultanova, İbrahimov, 2004).

## MATERİAL VƏ METODLAR

Tədqiqatın əsas obyekti Naxçıvan MR-in Araz çayı boyunca yerləşən maili düzənlikləridir. Regionun arid ərazilərinin flora və bitkiliyi 2003-2011-ci illərdə tədqiq edilmişdir. Tədqiqat materialı kimi herbari

fondlarından, çöl tədqiqatı zamanı əldə olunmuş nəticələrdən, yeni floristik və fitosenoloji tapıntılardan istifadə olunmuşdur. Aparılan tədqiqatlar çox cəhətli olduğundan ekspedisiya, monitorinq, biomorfoloji, floristik, sistematik, geobotaniki, bioekoloji, arealoji, təsərrüfat və riyazi üsullardan istifadə olunmuşdur. Öyrənilən lokal biotiplərin fitosenoz daxilində miqdarının müəyyənləşdirilməsi məhsuldarlıq göstəricilərinin qiymətləndirilməsi haqqında xüsusi işlənmiş tədqiqat üsulları və metodik göstərişlər yoxdur. Bu işlərin aparılması üçün L.Q.Ramenskinin (1937), İ.H.Beydemanın (1979), P.D.Yaroşenkonun (1969), E.A.Bıkovun (1960, 1962) ümümi qəbul olunmuş geobotaniki üsulları fonunda şəxsi mülahizələrimizdən, çoxillik təcrübə və vərdişlərimizdən istifadə etmişik.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Təbii və antropogen amillərin birlikdə, təbii mühitə təsirindən bitkilərin fenofoz səviyyədə vegetasiyalarında hər cür qeyri-müəyyənlik yaranır və ildən-ilə bunlar ya artır və yaxud başqa bir formada özünü büruzə verir. Nəticədə, əvvəllər kiçik talalarla rast gəlinən şoranlı qruplaşmalar, yeni yaranmış əlverişli ekoloji şəraitdə çox güclü inkişaf edərək geniş şoranlıq senozlarına çevrilmişdir. Otlaqlarda normadan çox-çox artıq xırda və iri buynuzlu mal-qara saxlanılır. Buna görə də otlaqlar çox tapdanmış və eroziya prosesi xeyli artmışdır. Eyni zamanda iqlim dəyişiklikləri, antropogen amillər (suvarmanın genişlənməsi, su anbarları, kanallar və kollektor-drenaj şəbəkəsi), hidrogeoloji şəraitdə kökündən baş verən dəyişikliklərlə əvəz olunaraq, torpaq-bitki örtüyünün umumi hidromorfluğu ilə birlikdə təbii mühitdə qeyri-müəyyən dəyişikliklərə səbəb olmuşdur. Qış otlaqları düzənliklərin çox şorlaşmış şorangəlik səhra, yarımsəhra və dağətəyi bozqır bitki tiplərini əhatə edir. Otlaqların əsas yem ehtiyatını birillik efemerlər təşkil edirlər. Onların arasında paxlalılara, taxıllara və müxtəlifotlara aid olan çox qiymətli yem bitkiləri vardır. Paxlalı bitki növlərinə təbii yem sahələrində dağınıq halda rast gəlindiyindən otluğun əsas kütləsini təşkil etmir və ikinci dərəcəli əhəmiyyət kəsb edirlər. Onlardan fərqli olaraq taxıllar otluğun formalaşmasında, biokütlənin artmasında birinci dərəcəli rola malikdirlər.

Bizim tədqiqatlarda başlıca problemlərdən biri müasir səhra senozlarında kserofit bitkilərin lokal biotiplərin formalaşmasına təsirini və rolunu öyrənməkdən ibarətdir. Səhra və yarımsəhra bitkilik tipi dünyanın bütün dövlətlərinin ərazisində bu və ya digər dərəcədə yayılmışdır. Lakin, onlar prinsipcə nə qədər yaxın olsalar da torpaq-iqlim xüsusiyyətləri, florası, bitki örtüyünün quruluşu, növ tərkibi, təbii məhdudlaşdırıcı - antropogen, texnogen və zoogen amillərin təsir dərəcəsinə görə və s. fərqlənirlər. Bütün bunlar isə öz növbəsində tarixi-təkamül prosesində ətraf mühitin biotik və abiotik amillərinin kompleks təsiri nəticəsində yaranıb formalaşmışdır. Müasir dövrdə davamlı xarekter almış qlobal iqlim dəyişilmələri mövcud səhra və yarımsəhra senozlarını kəmiyyət və keyfiyyətcə aşağı səviyyəyə salmaqla tamamilə səhralaşmağa doğru istiqamətlənmiş lokal biotiplərin təşəkkül tapmasına imkan yaratmışdır. Apardığımız tədqiqatların nəticəsi göstərir ki, səhra və yarımsəhra tipli bitkiliklər dedikdə, təkcə kserofit bitkilərin, məsələn kserofit kolların, yarımkolların, kolcuqların, yarımkolcuqların, qısa vegetasiya dövrü keçirən efemer və efemeroidlərin üstün olması əsas meyar kimi qəbul oluna bilməz. Kür-Araz ovalığı və Arazboyu düzənliklərdə inkişaf etmiş səhra və yarımsəhraların müqayisəli şəkildə öyrənilməsi bizim düşüncələrimizin doğruluğunu subut edir. Məlumdur ki, Naxçıvan MR ərazisində olan kontinental (K) və kəskin kontinental (KK) iqlim tipi nəinki Azərbaycan Respublikasında, eyni zamanda bütövlükdə Cənubi Qafqazda yoxdur. Bu regionun florası və bitki örtüyü əsasən kserofit tiplidir. Belə halda, deyilənlərə əsasən gərək Naxçıvan MR ərazisi başdan-başa səhra və yarımsəhradan ibarət olardı. Ancaq burada səhra və yarımsəhra senozları d.s. 600-1100 m yüksəkliklərdə yerləşir. Kür-Araz ovalığı ərazisində isə səhra və yarımsəhra senozları daha çox və səciyyəvidir. Həm də buradakı ərazilərin hündürlük səviyyəsi aşağıdır (300 m-dək), hətta d.s. 28 m aşağı olan sahələr də vardır. Onda belə sual ortaya çıxır ki, bəs səhra və yarımsəhranı formalaşdıran, onları fərqləndirən başlıca meyarlar nədən ibarətdir?....

Apardığımız uzun müddətli tədqiqatların nəticəsi olaraq deyə bilərik ki, səhra və yarımsəhralar tarixi geoloji dövrlərdə əlverişsiz iqlim təsirilə yaranmış, seyrək bitki örtüyünə malik olan, ekoloji (iqlim, su, külək, şorlaşma və s.), antropogen, zoogen amillərin kompleks təsirindən eroziyaya, deflyasiyaya, deqradasiyaya uğrayan, səhralaşmaya və bozqırlaşmaya meyilli olan, ekstremal şəraitdə torpaq-bitki əlaqələrində tarazlığın pozulması, bioloji məhsuldarlığın azalması, bioloji potensialın dağılması təhlükəsi altında olan ekosistemlərdir.

Müasir dövrün iqlim dəyişilmələri bir çox ərazilərdə bitkiliyin zonallıq xarakterinin də dəyişilməsinə gətirib çıxarmışdır. Belə ki, əvvəllər Arazboyu düzənliklrdə kiçik ləkələr şəklində rast gəlinən introzonal şorangəlik səhra bitkiliyi hazırda tamamilə zonallıq təşkil etməklə bütün Arazboyu düzənlikləri əhatə edir. Arazboyu düzənliklərin təkrar duzlaşmış torpaqlarında tipik səhra bitkilərinin dominantlığı ilə halofit və efemerli-halofitli səhra senozları geniş areala malikdir. Belə fitosenozlarda

yarımkollar, kolcuqlar, yarımkolcuqlar, həmçinin vegetasiyası qısa müddətdə başa çatan birillik efemer və efemeroid halofitlər bol təmsil olunmuşlar. Xüsusilə, burada çiçəkli şoravcə - *Seidlitzia florida* (Bieb.) Bunge, atlı çərən - *Suaeda altissima* (L.) Pall., kol çərəni - *S. dendroides* C.A. Mey.) Moq., ətli şoran - *Salsola crassa* Bieb., budaqlı qışotu - *Petrosimonia brachiata* (Pall.) Bunge və b. səhra senozları daxilində özünəməxsus taksonomik tərkibə və senoloji quruluşa malik olan kserofit bitkilər lokal biotiplər əmələ gətirirlər. Buna qeyd olunan əlverişsiz ekoloji şəraitdə daha geniş yayılmış kcerohalofit yarımkollu formasiyalarda: lerxianyovşanlı - *Artemiseta lerchianae,* qumluqyovşanlı – *Artemiseta arenariae,* şorgiləşoranlı *Salsoleta nitrariae* və digər bitki qruplaşmalarında formalaşan lokal biotiplər misal ola bilər.

Arazboyu düzənliklərin qrunt sularının səthə yaxın olduğu yaxud, üzə çıxdığı duzlu sucaqlarda, bataqlıqlaşmış yerlərdə, gölməçələr ətrafında, çökəkliklərdə, güclü minerallaşmış çöllərdə, çay və arx ətrafında, suvarma kanallarının şorakətli sahillərində sıx bitən avropa duzlaqçoğanlı - *Salicornieta europaeae*, yağlısirkənli - *Atriplexeta nitensis* və s. kimi birillik bitkilərin formasiyaları üstünlük təşkil edir. Onlara yaxın olan anoloji sahələrdə, təkrar şorlaşmaya məruz qalmış torpaq və qrunt suları olan keçid tipli torpaqlarda minerallaşma daha sürətlə gedir (Quliyev, 2007; Zaxarov, 1939). Burada əsasən kserohalofit kolcuqlu formasiyalar məsələn: saqqallıhali-mionlu - *Halimioneta verruciferae*, belange-saksaulu - *Halostachyeta belangerianae*, tüklüsayqaçotulu - *Frankenieta hirsutae*, sərt-kənarnoealı - *Noeta strobilaceae*, müxtəlif-çərənli - *Suaedeta confusae*, yoğunlaşmış-sarsazanlı - *Halocnemeta strobilaceae,* dəstəli çayyovşanı - *Myricarieta bracteatae,* sərilən-əzgənli - *Kochieta prostratae,* budaqlıyul-ğunlu - *Tamariceta ramosissimae,* koçiyul-ğunlu - *Tamariceta kotschyae,* hohenaker-yulğunlu - *Tamariceta hohenackeriae* və b. formasiyaları gur inkişaf edir. Duzlaşmış və şoranlaşmış səhra bitkiliyində diqqəti cəlb edən geniş yayılmış mühüm senozlar sırasına həm də şoberşorgiləli - *Nitrarieta cshoberiae,* xəzərsarıbaşlı - *Kalidieta caspicae,* iriçiçək-xostəkli - *Caraganeta grandiflorae,* adidəvəti-kanlı-meyerdəvəayağılı - *Alhageto-Limoniosum* assosiasiyası, ağacvarişoranlı və ya qara-ğanlı - *Salsoleta dendroideae,* ləkəlişoranlı - *Salsoleta glaucae* və onların lokal biotipləri daxildir. Qeyd olunan senozəmələgətirici halofit bitki növləri səhra bitkiliyində əsas dominant, subdominant, edifikator kimi fitosenozun qurucusu və həmdə lokal biotiplərin əsas komponenti kimi iştirak edirlər. Bu fitosenozlar mal-qaranın anoloqu olmayan əsas qış otlaqlarıdır. Apardığımız çoxsaylı fenoloji müşahidələr, bioekoloji, fitosenoloji və məhsuldarlıq qiymətləndirmələri ilə müəyyən olunmuşdur ki, senoz daxilində lokal biotplərin sayı, onların kəmiyyət və keyfiyyət göstəriciləri mühüm əhəmiyyətə malikdir.

Tədqiq olunan ərazilərin yarımsəhralarında efemerlərin iştirakı ilə adi üzərlik *Peganum harmala* L., adi həlməl - *Zigophyllum fabago* L., iriçiçək xöstək - *Caragana grandiflora* DC., tatar sirkəni - *Atriplex tatarica* L., qovuqlu bozalaq - *Lepidium vesicarium* L., kiçik pişiknanəsi - *Nepeta micrantha* L. və b. da lokal biotiplər əmələ gətirirlər. Onların tez-tez müşahidə olunan komponentləri sırasına *Artemisia arenaria* DC., *Agropyrum cristatum* L., *Salsola szovitsiana* və s. daxil olur. Hansı ki, yay aylarında ot örtüyündə çoxilliklərin topladıqları qida maddələri və onlarda potensial halda yığılan enerji payızda böyümə üçün sərf olunur.

Səhra və yarımsəhralarda efemerlərin iştirakı ilə yovşanlıqlar - *Artemiseto-Ephemeretum*, şorangəli yovşanlıqlar - *Artemiseto-Salsoletum* və onların müxtəlif variantlı lokal biotipləri üstünlük təşkil edir. Onlar ekoloji şəraiti, fitosenoloji quruluşu və digər bioekoloji xüsusiyyətlərinə görə səhra bitkiliyinin fitosenozlarından seçilirlər. Lerxian və ya iyli yovşan - *Artemisia lerchiana* bir çox səhra bitki qruplaşmalarında komponent kimi iştirak etməklə yanaşı, həm də yovşanlı yarımsəhra senozlarının əsas qurucusudur. Yovşanlıqlar səhralarda lokal şəklində intrazonallıq təşkil edir. Əksinə, yarımsəhralarda onlar daha geniş yayılmaqla zonallıq əmələ gətirir. Yovşanlı yarımsəhralar səhra bitkiliyinin ən geniş yayılmış variantıdır. Düzənliklərin nisbətən az şoran torpaqlarında geniş yovşanlı səhra zolağı şəklində ot örtüyü əmələ gətirirlər. Baxmayaraq ki, yovşanlıqların bir çox sahələri kənd təsərrüfatı bitkiləri üçün əkin sahəsinə çevrilmişdir, lakin hal-hazırda ayrı-ayrı massivlərdə yovşanlı yarımsəhralar saxlanılır və yaxşı qış otlağı kimi istifadə olunur. Qış otlaqları kimi istifadə edilən sahələrdə yovşanlıqlar mühüm yer tutur ki, onların da botaniki tərkibində bir sıra taxıl bitkiləri ot örtüyünün yem keyfiyyətini artırmaqla başlıca komponent kimi iştirak edir. Fitosenoloji strukturası etibarılə lerxian yovşanlığı yarımsəhraya çox oxşayır, lakin ondan fərqli olaraq şorangəli-yovşanlıq yarımsəhrasında hallofitlərə daha çox rast gəlinir.

Müasir səhra senozlarında əlverişsiz quraqlığa, şorlaşmaya, küləklə sovrulmaya və digər bu kimi məhvedici amillərə qarşı uyğunlaşma əlaməti olaraq kserofit bitkilərin inkişaf etmiş bu lokal biotipləri özlərinin qoruyucu funkciyaları ilə cəhra və yarımsəhralarda çox mühüm bioloji əhəmiyyətə malikdirlər. Daha doğrusu, quraq ərazilərin kserofit bitkiləri arasında dözülməz şəraitə qarşı lokallaşma prosesi baş verir. Məlumdur ki, bitkilər məskunlaşdıqları ekotoplarda onlar üçün zəruri olan həyat şəraiti (yer, işıq, qida, su, hava və s.) uğrunda rəqabət aparırlar. Ekstremal şəraitdə bir çox bitkilər

arasında birgə yaşamağa imkan verən uyğunlaşmalar yaranır. Bura fitosenozu əhatə edən areal daxilində formalaşan populyasiyalar, bitki qruplaşmaları, lokal və ya ləkələr şəklində əmələ gələn biotiplər misal ola bilər. Lokal biotiplərdə toplanmış bitkilər biri digərinə zərər yetirmədən, biri-birindən faydalanaraq vegetasiyalarını davam etdirirlər. Onların birgə yaşamalarına kömək edən mühüm uyğunlaşmalardan biri də bitkilərin biotoplarda mərtəbələrlə (yaruslarla) yerləşmələridir.

Lokal biotiplərin taksonomik tərkibində iştirak edən bitki növlərinin həyat formalarından, bolluğundan, sıxlığından asılı olaraq, bir-birindən fərqlənirlər. Səhra və yarımsəhraların lokal biotiplərində kollar, yarımkollar, kolcuqlar, yarımkolcuqlar üst mərtəbələrdə yerləşirlər. Bu mərtəbədəki bitkilərin yaratdığı əlverişli mikroiqlim şəraitində ondan aşağıda yerləşən kölgəyədavamlı kolların, çoxillik və birillik ot bitkilərinin, mamırların, yosunların məhv olmasının qarşısını alır. Səhra və yarımsəhra fitosenozlarında lokal biotiplər bir-birindən təcrid olunmuş halda ləkələrlə rast gəlinirlər. Onların taksonomik tərkibində 8-12 bəzən isə 14-15 bitki növünə rast gəlinir. Mövcud düzənliklərdə: Sədərək, Şərur, Böyükdüz, Gülüstan və s. lokal biotipləri müəyyənlişdirmk üçün ərazinin hamarlığını, genişliyini və lokal biotiplərin gözlə yaxşı müşahidə olundugunu nəzərə alaraq, daha iri həcmli nümunə meydançaları seçilmişdir.

Belə ki, nisbətən alçaq maili təpəcikli sahələrdə 5000 $m^2$, tamamilə əlverişli hamar düzənliklərdə isə 10000 $m^2$ ölçüdə, 3 təkrarda nümunə meydançaları (NM) götürülmüşdür. Seçilmiş NM hər biri 100 x100 $m^2$ olmaqla 10 kvadrata bölünmüşdür. I, II, III NM-da ayrı-ayrılıqda lokal biotiplər sayılmışdır: 1=13; II=15; III=8. Sonra B=K+L+M formulundan istifadə olunmuşdur (Nabiyeva and Ibadullayeva 2012). Burada B–lokal biotiplərin cəmi, K, L, M isə təkrar variantlardır. Variantların cəmindən alınan rəqəmi, onların sayına bölməklə orta rəqəm tapılmışdır:

***B=(K+L+M):3*=(13+15+8):3=36:3=12.**

İstifadə olunan formulu anoloji sahələrə şamil etməklə, əldə olunan lokal biotiplərin sayı ümumiləşdirilmişdir (cədvəl).

Beləliklə, LB sayı artdıqca senozun məhsuldarlığı yüksək olmaqla yanaşı, lokal biotiplərin yaratdığı mikroiqlim şəraiti ətrafdakı digər bitkilərə də müsbət təsir göstərir. Arazboyu düzənliklərin səhra senozlarında inkişaf etmiş kserofit bitkilərin yaratdığı lokal biotiplər növ tərkibinin kasıblığı ilə səciyyələnirlər (Nəbiyeva, İbrahimov, 2011).

Cədvəldən göründüyü kimi qış otlaqlarında lokal biotiplərin sayı qeyri-bərabər olmaqla 1 ha-da 5-12 arasnda dəyişir. Belə ki, rayonlar üzrə cəmi 16342 ha qış otlağının 2689,6 ha-da (16,5%) 20300 lokal biotiplərin olduğu hesablanmışdır.

Səhra və yarımsəhra senozlarında qeyd olunan növlərin üstünlüyü ilə inkifaf edən bitki birlikləri landşaft əmələgətirici əhəmiyyətə malikdirlər. Onların taksonomik tərkibləri zəngin olmasa da əsas senozəmələgətiricilər mal-qara tərəfindən yaxşı yeyildiyindən düzənliklərin səhra, yarımsəhra bitkilikləri təbii yem ehtiyatı baxımından böyük təsərrüfat əhəmiyyətinə malikdirlər.

Arazboyu düzənliklərdə yarımsəhraların florası daha zəngindir. Payız-yaz dövrlərində onların layihə örtüyü 70-75(85)% olduğu halda, səhralarda bu örtük 35-40, bəzən daha az olur. Qeyd olunan bitki qruplaşmlarının yem keyfiyyəti orada bolluq təşkil edən və ya komponent kimi iştirak edən birillik yem bitkilərindən, efemer və efemeroidlərdən çox asılıdır. Onlar iri kol və kolcuqların aralarında, kölgəli yerlərdə yaşıl örtük əmələ gətirirlər. Bu müddətdə senozun lokal biotipləri ətrafındakı açıq yerlərində kserofit bitkiləri qızmar günəş şüaları, külək, şorlaşma, otarma kimi məhdudlaşdırıcı təsirlər altında təravətini itirir və quruyaraq küləklə sovrulur. Buna görə səhra və yarımsəhraların geniş ərazisində lokal biotiplər biri-birindən xeyli aralı kiçik yaşıl talalar şəklində görünür.

Arazboyu düzənliklərdə, xüsusilə Kəngərli rayonunun Böyükdüz kəndi yaxınlığında 2008-2009-cu illərdə çox da böyük olmayan çılpaq sahələrdə (5-10 $m^2$) quraqlığa davamlı kserofit bitkilərin toxumlarını əkməklə apardığımız eksperimental təcrübə işləri, fenoloji müşahidələr

**Cədvəl.** Naxçıvan MR qış otlaqlarında lokal biotiplərin miqdarı

| Rayonlar | Qış otlaqları, ha | Lokal biotipli qış otlaqları, ha | Lokal biotiplərin sayı, 1 ha | Lokal biotiplərin miqdarı |
|---|---|---|---|---|
| Babək | 8910 | 891,6 | 7 | 6241,2 |
| Culfa | 1000 | 420,7 | 5 | 2105,5 |
| Ordubad | 228 | 153, 5 | 8 | 1228,0 |
| Sədərək | 1734 | 346,8 | 6 | 2080,8 |
| Şahbuz | 663 | 210,4 | 10 | 2104,0 |
| Şərur | 2905 | 486,2 | 9 | 4375,8 |
| Kəngərli | 902 | 180,4 | 12 | 2164,8 |
| **CƏMİ:** | 16342 | 2689,6 | | 20300,1 |

göstərdi ki, bu yolla nəinki təkcə arid ərazilərdə lokal biotiplərin sayını artırmaq, eyni zamanda boş qalmış çılpaq yerləri yüngülcə dımrıqlayıb qiymətli taxıl və paxlalı efemer yem bitkilərinin toxumlarını səpməklə o yerlərin məhsuldarlığını müəyyən qədər artırmaq mümkündür. Butün bunlar, həm də səhralaşma prosesinin təsirini azaltmış olar. Təcrübə sahəsində əkilmiş bitki toxumlarının cücərməsi, inkişafı və bununla bərabər bir neçə senozəmələgətirici bitki növünün və onun yaratdığı lokal biotipin vegetasiya dövrü izlənilmiş, fenospektirləri tərtib olunmuşdur.

## NƏTİCƏLƏR

Beləliklə, müasir səhra və yarımsəhra fitosenozlarının kserofit bitkiləri dözülməz şəraitə qarşı uyğunlaşma əlaməti olaraq, lokal biotiplərin formalaşmasına güclü təsir göstərirlər. Arid ərazilərdəki qış otlaqlarının məhsuldarlığının artırılmasında və yem keyfiyyətinin yüksəldilməsində yaranmış lokal biotiplər böyük rol oynayır. Bu da mal-qaranın qidaya tələbatı çox olan payız, qış və yaz aylarında, təbii yaşıl yemlə təmin olunması sahəsində mühüm əhəmiyyətə malikdir.

Naxçıvan MR-in Arazboyu düzənliklərini əhatə edən, qış otlağı kimi istifadə olunan səhra və yarımsəhralarda ilk dəfə olaraq lokal biotiplərin sayı müəyyən edilmişdir.

Öyrənilmişdir ki, qış otlaqlarında lokal biotiplərin sayı qeyri-bərabər olmaqla, 1 ha-da 5-12 arasnda dəyişir. Rayonlar üzrə cəmi 16342 ha qış otlağının 2689,6 ha-da (16,5%) 20300 lokal biotiplərin olduğu hesablanmış onların növ tərkibi və bioloji rolu öyrənilmişdir.

## ƏDƏBİYYAT

**Nəbiyeva F.X.** (2010) Arid ərazilərin florası və səhralaşma (Kür-Araz ovalığı, Arazboyu düzənliklər). Naxçıvan: Tusi, 242 s.

**Nəbiyeva F.X., İbrahimov Ə.Ş.** (2011) Yarımsəhra və səhra ekosistemlərinin deqradasiyası. Naxçıvan: Tusi, 135 s.

**Sultanova Z.R., İbrahimov Ə.Ş.** (2004) Naxçıvan MR-in səhra və yarımsəhra yem bitkiləri. AMEA Botanika İnstitutunun əsərləri, **XXV:** 290-293.

**Бейдеман И.Н.** (1979) Методика изучения фенологии растений и растительных сообществ. Новосибирск: Наука, 155 с.

**Быков Б.А.** (1960, 1962) Доминанты раститель-ного покрова Советского Союза. АН Каз. ССР, Алма-Ата: Наука, т. I, 314 с.; т. II, 436 с.

**Захаров С.А.** (1939) Почвы Нахичеванской АССР. Баку: Изд.Аз.ФАН СССР, 315 с.

**Залибеков З.Г.** (1990) Об условиях мобилизации биологического потенциала аридных земель. Проблемы освоения пустынь. Научно-теоротический журнал. Ашхабад: Ылым, **№1:** 16-31.

**Прилипко Л.И.** (1939) Растительные отношения Нахичеванской АССР. Баку: Аз.ФАН, 196 с.

**Раменски Л.Г.** (1937) Учет и описание растительности М.: ВАСХНИЛ, с.100

**Ярошенко П.Д.** (1969) Геоботаника. М.: 198с.

**Nabiyeva F.Kh., Ibadullayeva S.J.** (2012) Development Appropriatenesses of Deserting Processes in The KAP and The PAR. Global Advanced Research Journal of Geography and Regional Planning Vol. 1(5) pp. 083-087

**Ф.Х. Набиева**

### Исследования Фитоценозов Пустынь и Полупустынь Приараксинской Низменности Нахчыванской Автономной Республики

В статье приводятся результаты исследования влияния современных пустынных фитоценозов на формирование локальных биотипов ксерофитных растений. Установлено что, в современных пустынных фитоценозах идет процесс локализации ксерофитных растений вследствие влияния неблагоприятных природных условий (засуха, засоленность почвы, выветривание, деградация и другие разрушительные факторы). Впервые нами в низменностях Садарак, Шарур, Боюкдюз, Гюлюстан на научной основе изучены процессы локализации ксерофитных растений. Выявлено 20300 локальных биотипов, исследован их видовой состав, фитоценологическое строение и биологическая роль.

**F.Kh. Nabiyeva**

**Studies on Phytocenoses of the Desert and Semi-Desert Lowlands Stretching Along the Araz river in Nakhchivan Autonomous Republic**

The paper presents the results of investigations of the influence of modern desert plant communities in the formation of local biotypes xerophytic plants. It is was found out in the process of localization of xerophytic plants is going on in modern desert plant communities due to the influence of unfavorable environmental conditions (drought, salinity, erosion, degradation and other destructive factors.) For the first time the process of localization of xerophyte plants has been studied by us in Sadarak, Sharur, Boyukduz and Gulustan lowlands 20300 local biotipes were identified their specific composition, phytocenological structure and biological zole was revealed.

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 75-70 (2012)

# Boz-Qəhvəyi Torpaqların Morfoloji Əlamətlərinin Təsviri və Əsas Fiziki-Kimyəvi Göstəriciləri

**V.V.Bəşirov**
*Azərbaycan Dövlət Aqrar Universiteti, Atatürk prospekti 262, Gəncə AZ2000, Azərbaycan,*
*E-mail: vugar.bashirov@gmail.com*

**Tədqiqatın məqsədi Gəncə-Qazax bölgəsində yayılmış taxılaltı boz-qəhvəyi torpaqların profilinin morfoloji təsvirini vermək və bu torpaqların əsas fiziki-kimyəvi göstəricilərinin (hiqroskopik nəmlik, qranulometrik tərkib, humus, ümumi azot, $CaCO_3$, pH, udulmuş əsasların cəmi, sıxlıq) laboratoriya analizi nəticələrini təhlil etmək olmuşdur. Bu göstəricilərin tədqiqi əsasında boz-qəhvəyi torpaqların münbitliyinin yüksəldilməsi üçün aqrotexniki, aqrokimyəvi və meliorativ tədbirlər təklif edilmişdir.**
***Açar sözlər:*** *qranulometrik tərkib, genetik qatlar, profil, karbonatlıq, humus.*

## GİRİŞ

Boz-qəhvəyi (şabalıdı) torpaqlar Azərbaycan ərazisinin 2200,6 min hektar və ya 25,5%-i təşkil etməklə çox hissəsi dəmyə və suvarılan bağların, üzümlüklərin, nar bağlarının, dənli və texniki bitkilər altında istifadə olunur (Məmmədov, 2007). Gəncə-Qazax bölgəsinin torpaq örtüyünün strukturunda əsas etibarilə adi boz-qəhvəyi (şabalıdı) - *Haplic Kastanozems*, açıq boz-qəhvəyi (şabalıdı) - *Calcic Kastanozems* və qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı) - *Irragric Kastanozems* torpaqlar kompleksi ayrılır (Babayev və b., 2006; FAO, 2006; Bashirov, 2009).

*Adi boz-qəhvəyi (şabalıdı)* torpaqlar Kiçik Qafqazın dağ ətəkləri boyu, Kür-Araz ovalığının ətraf hissələrində 200-400 m yüksəkliklər arasında yarımdairə şəklində əraziləri əhatə edir. Bu torpaqlar respublikamızın quru bozqırlar zonasında çox vaxt yovşanlı-efemerli-taxılkimilər senozları altında formalaşırlar. Yağıntıların miqdarı və digər iqlim elementləri ilə əlaqədar olaraq göstərilən torpaqlar yuyucu olmayan su rejimi şəraitində inkişaf edirlər.

*Açıq boz-qəhvəyi (şabalıdı)* torpaqlar boz-qəhvəyi torpaqlar tipinin daha arid variantı olub quru çöllərin daha quraq hissələrində, Kiçik Qafqazın maili şleyf yamaclarında, dağətəyi düzənliklərin aşağı quru bozqır və yarımsəhralarında inkişaf etmişdir. Təsvir edilən torpaqlar başlıca olaraq yovşan-ağot, efemer-yovşan, bəzi hallarda yovşanlı-taxılkimilərli-efemer bitkilər altında formalaşırlar. Açıq boz-qəhvəyi (şabalıdı) torpaqlar delüvial, bəzi yerlərdə isə delüvial-prolüvial mənşəli karbonatlı, gipsli və lössşəkilli gillicələr, əhəngdaşlı qumlucaların çınqıllı aşınma məhsulları və s. süxurlar üzərində əmələ gəlirlər (Məmmədov, 2007).

*Qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı)* torpaqlar kifayət qədər geniş zolaq şəklində dağətəkləri boyunca və bölgənin Kürə doğru maili düzənliyində yayılmaqla respublika ərazisinin 18,5%-ni təşkil edir. Bu torpaqlar üçün quru çöllərin iqlimi və bitkiliyi səciyyəvidir. Yağıntıların az olması və il ərzində qeyri-bərabər şəkildə paylanması suvarma zəruriyyəti yaradır. Uzun müddət suvarma əkinçiliyində istifadə olunduğundan xam torpaqlara xas olan rütubət rejimi dəyişib, irriqasiyalı avtomorf nəmlənmə rejimi inkişaf tapmışdır. Suvarma sularının mənbəyini şəffaf kəhriz, bulaq, çay, artezian suları təşkil edir, nəmlənmə rejimi asan həll olan birləşmələrin profil boyu hərəkətinə şərait yaradır (Salayev və b., 2004; Бабаев, 1984).

## MATERİAL VƏ METODLAR

***Tədqiqat obyekti.*** Tədqiqat obyekti Kiçik Qafqazın şimal-qərb yamaclarının dağətəyi və düzənlik hissələrində yerləşir. Torpaq nümunələri Goranboy rayonunun Nizami (40°41'10.57" şm.e. və 46° 31'28.97" ş.u., dəniz səviyyəsindən hündürlüyü 267 m), Göygöl rayonunun Bəhrəmbəy (40°38' 02.95" şm.e. və 46°21'14.16" ş.u., dəniz səviyyəsindən hündürlüyü 535 m), Samux rayonunun Tatlı (40°42'26.75" şm.e. və 46°28'15.56" ş.u., dəniz səviyyəsindən hündürlüyü 260 m) kəndlərindən götürülmüşdür.

***Tədqiqatın metodikası.*** Götürülmüş torpaq nümunələri laboratoriya şəraitində aşağıdakı üsulların köməkliyi ilə tədqiq edilmişdir: nümunələrin təbii və hiqroskopik nəmliyi – termik üsulla; humus və azotun təyini – İ.V.Tyurin üsulu ilə; karbonatların təyini – kalsimetr üsulu ilə; qranulometrik tərkibin analizi – N.A.Kaçinskinin modifikasiyasında pipet metodu ilə; udulmuş əsasların cəmi – D.V.İvanov üsulu ilə, torpağın sıxlığı dəqiq həcmi məlum olan silindrlər vasitəsilə təyin edilmişdir (Şəfibəyov, 1964; Myxa, 2010).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Tədqiqat işində Gəncə-Qazax bölgəsində yayılmış taxılaltı boz-qəhvəyi (şabalıdı) torpaqların morfoloji əlamətlərinin təsviri və əsas fiziki-kimyəvi göstəricilərinin təhlili verilmişdir.

***1. Qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı) torpaqlar.*** Bu torpaqlar yüksək təbii drenləşmə qabiliyyəti olan dağətəyi düzənlik hissədə yayılmışdır. Goranboy rayonu Nizami kəndində "Əbil" fermer təsərrüfatının ərazisində payızlıq buğda altında olan sahədə qazılmış 15 №-li kəsimin təsviri aşağıdakı kimidir.

AU'aca 0-30 sm – bozumtul-şabalıdı və yaxud boz-qonuru, gilli, xırda kəltənvarı-tozlu, yumşaq, köklər və kökcüklər, bitki qalıqları, torpaq faunasının izləri, keçid tədricidir, zəif qaynayır.

AU"aca 30-54 sm – bozumtul-şabalıdı və yaxud bozumtul, ağır gilliсəli, kəsəkli-tozlu strukturlu, güclü kipləşmiş, köklər və kökcüklər, keçid tədricidir, qaynayır.

A/Bca 54-77 sm – boz-qonur, lilli-gilli, kəltənvarı-topavarı, bərkimiş, nəmli, keçidi aydın, qaynayır.

Bca 77-100 sm – bozumtul-samanı, ağır gilliсəli, karbonatlar kif şəklindədir, yaxşı aqreqatlaşmış, ana süxura tədrici keçid, şiddətli qaynayır.

Cca 100-135 sm – samanı, ağır gilliсəli, gips və karbonat hissəcikləri, süxur qırıntıları, şiddətli qaynayır.

Suvarma suları ilə gətirilib toplanan çöküntülərin və mütəmadi suvarma nəticəsində yaranan xüsusi rütubətlənmə rejiminin təsiri altında qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı) torpaqların morfoloji quruluşu və diaqnostik göstəriciləri xam torpaqlardan köklü fərqlənir. Morfoloji təsvirdən göründüyü kimi, torpaqların rəngi profil boyu üst qatlarda bozumtul-şabalıdı olub aşağı qatlarda samanı rəngə qədər dəyişir. Profildə genetik qatların fərqlənməsi dəqiq deyildir. Qranulometrik tərkibin analiz nəticələrindən (Cədvəl 1) göründüyü kimi torpaqların profilində fiziki gilin miqdarı (<0,01 mm) 54,46-65,38%, lil fraksiyasının (<0,001 mm) miqdarı isə 21,08-25,77% intervalında dəyişir. Qranulomterik tərkibdə lil fraksiyası üstünlük təşkil edir. Torpaq profilinin üst hissəsində mədəniləşmiş, qalın aqroirriqasiya qatı (AU=40-50 sm) formalaşmışdır. Qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı) torpaqlar gilli-gilliсəli qranulometrik tərkiblə xarakterizə olunur və fiziki gilin miqdarının üst qatdan alt qatlara doğru artması müşahidə olunur.

***2. Adi boz-qəhvəyi (şabalıdı) torpaqlar.*** Bu torpaqlar ərazinin əsasən dağətəyi hissəsində yayılmışdır. Göygöl rayonu Bəhrəmbəy kəndində "Araz-2" çoxsahəli müəssisəsinin ərazisində qoyulmuş 34 №-li kəsimə görə bu torpaqların morfoloji əlamətlərini aşağıdakı kimi təsvir etmək olar:

AUaca 0-32 sm – şabalıdı, ağır gilliсəli, yumşaq, kəltənvarı strukturlu, bitki kökləri, kökcüklər, bitki qalıqları, torpaq faunasının izləri, keçid tədricidir, zəif qaynayır.

A/Bca 32-62 sm – bozumtul-şabalıdı, ağır gilliсəli, dənəvər, kipləşmiş, bitki kökləri və kökcüklər, keçid aydın, şiddətli qaynayır.

Bca 62-90 sm – bozumtul, karbonatlı, ağ gözcüklər, karbonat ləkələri, ağır gilliсəli, yaxşı aqreqatlaşmış, yumşaq, az kipləşmiş, keçid tədricidir, qaynayır.

Cca 90-129 sm – bozumtul-qonuru, ağır gilliсəli, strukturu qeyri-müəyyən, məsaməli, yumşaq, süxur qırıntıları, qaynayır.

Kəsimin təsvirindən göründüyü kimi, morfoloji cəhətdən adi boz-qəhvəyi (şabalıdı) torpaqların profilində çürüntülü-akkumulyativ A, illüvial karbonatlı B və əsasən karbonatlı gilliсələrdən ibarət olan C horizontları aydın seçilir. Bu torpaqların rəngi üst qatlarda şabalıdı, aşağı qatlarda isə bozumtul-şabalıdı, bozumtul və bozumtul-qonurudur. B horizontu nisbətən bərk quruluşu və karbonatlı olması ilə səciyyələnir. Profilin strukturu üst qatlarda kəltənvarı və dənəvər, lap aşağıda isə qeyri-müəyyəndir. Profil boyu fiziki gilin miqdarı 53,63%-dən 56,05%-ə qədər dəyişir, qranulometrik tərkib ağır gilliсəlidir.

***3. Açıq boz-qəhvəyi (şabalıdı) torpaqlar.*** Bu torpaqlar Gəncə-Qazax bölgəsinin əsasən aran düzənlik hissəsində yayılmışdır. Torpaqlar 0-100 sm dərinliyində olan bir qatda qranulometrik tərkibcə ağır gilliсəlidir. Açıq boz-qəhvəyi (şabalıdı) torpaqların morfoloji əlamətləri ilə tanış olmaq üçün Samux rayonu Tatlı kəndində yerləşən "Turac" fermer təsərrüfatının ərazisində qoyulmuş 27 №-li kəsimin təsvirini veririk.

AYaca 0-30 sm – açıq şabalıdı, ağır gilliсəli, yumşaq, kəltənvarı-tozlu strukturlu, bitki kökləri, kökcüklər, bitki qalıqları, torpaq faunasının izləri, keçid tədricidir, zəif qaynayır.

Bca 30-58 sm – bozumtul-şabalıdı, gilli, xırda dənəvər, kipləşmiş, çaqıl daşlı, bitki kökləri və kökcüklər, keçid aydın, qaynayır.

B/Cca 58-90 sm – bozumtul, karbonatlı, ağ gözcüklər, mitsel və unşəkilli karbonat ləkələri, ağır gilliсəli, yaxşı aqreqatlaşmış, az kipləşmiş, keçid tədricidir, şiddətli qaynayır.

Cca 90-135 sm – bozumtul-samanı, ağır gilliсəli, kiçik məsaməli, yumşaq, kiçik gips kristalları, şiddətli qaynayır.

Morfoloji təsvirdən görünür ki, bu torpaqların genetik profili tozlu-kəltənvarı strukturlu, yuxa humus qatının olması, orta illüvial karbonatlı qatın xeyli bərkiməsi və karbonat ağgözcüklərin aydın seçilməsi, qranulometrik tərkibin xeyli ağırlaşması,

**Cədvəl 1.** Gəncə-Qazax bölgəsində yayılmış torpaqların qranulometrik tərkibi (P < 5.0%)

| Genetik qatlar və dərinlik, sm | Hissəciklərin ölçüsü (mm-lə) və miqdarı (%-lə) | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | 1,0-0,25 | 0,25-0,05 | 0,05-0,01 | 0,01-0,005 | 0,005-0,001 | <0,001 | <0,01 |
| Qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı) | | | | | | | |
| AU'aca 0-30 | 2,34 | 10,04 | 25,12 | 13,17 | 26,21 | 24,2 | 63,58 |
| AU"aca 30-54 | 2,68 | 9,95 | 22,16 | 12,2 | 27,6 | 25,41 | 65,21 |
| A/Bca 54-77 | 2,62 | 10,35 | 21,65 | 11,49 | 28,12 | 25,77 | 65,38 |
| Bca 77-100 | 2,21 | 14,72 | 24,16 | 13,18 | 21,14 | 24,65 | 58,97 |
| Cca 100-135 | 1,85 | 20,08 | 23,62 | 15,89 | 17,49 | 21,08 | 54,46 |
| Adi boz-qəhvəyi (şabalıdı) | | | | | | | |
| AUaca 0-32 | 2,61 | 14,75 | 27,57 | 12,84 | 21,24 | 21,06 | 55,14 |
| A/Bca 32-62 | 3,22 | 11,34 | 29,4 | 11,31 | 22,34 | 22,40 | 56,05 |
| Bca 62-90 | 3,35 | 10,96 | 31,64 | 9,66 | 22,36 | 22,04 | 54,06 |
| Cca 90-129 | 3,85 | 15,81 | 26,72 | 10,42 | 24,01 | 19,20 | 53,63 |
| Açıq boz-qəhvəyi (şabalıdı) | | | | | | | |
| AYaca 0-30 | 2,4 | 13,92 | 25,61 | 14,1 | 22,67 | 21,3 | 58,07 |
| Bca 30-58 | 3,25 | 11,03 | 23,98 | 11,79 | 25,66 | 24,33 | 61,78 |
| B/Cca 58-90 | 3,53 | 15,79 | 31,35 | 9,93 | 21,29 | 18,16 | 49,38 |
| Cca 90-135 | 4,08 | 26,57 | 22,2 | 12,47 | 19,08 | 15,64 | 47,19 |

**Cədvəl 2.** Boz-qəhvəyi (şabalıdı) torpaqların əsas fiziki-kimyəvi göstəriciləri (P < 3.0%)

| Genetik qatlar və dərinlik, sm | Hiqrosko-pik nəmlik, % | Humus, % | Ümumi azot, % | $CaCO_3$, % | pH, su məhlu-lunda | Udul. əsas-lar, mq.ekv./ 100q torp. | <0,001 mm hissəciklərin miqdarı, % | <0,01 mm hissəciklərin miqdarı, % | Sıxlıq, q/sm3 |
|---|---|---|---|---|---|---|---|---|---|
| Qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı) | | | | | | | | | |
| AU'aca 0-30 | 7,18 | 2,68 | 0,174 | 3,6 | 7,2 | 30,47 | 24,2 | 63,58 | 1,21 |
| AU"aca 30-54 | 6,21 | 1,82 | 0,138 | 4,1 | 7,3 | 28,13 | 25,41 | 65,21 | 1,23 |
| A/Bca 54-77 | 5,30 | 1,61 | 0,112 | 5,3 | 7,4 | 29,86 | 25,77 | 65,38 | 1,29 |
| Bca 77-100 | 3,84 | 1,20 | t. olm. | 10,9 | 7,4 | 27,40 | 24,65 | 58,97 | 1,41 |
| Cca 100-135 | 2,45 | 0,45 | “-----“ | 15,4 | 7,5 | 27,52 | 21,08 | 54,46 | t. olm. |
| Adi boz-qəhvəyi (şabalıdı) | | | | | | | | | |
| AUaca 0-32 | 7,30 | 2,88 | 0,203 | 5,4 | 7,1 | 29,72 | 21,06 | 55,14 | 1,12 |
| A/Bca 32-62 | 5,26 | 1,90 | 0,148 | 9,5 | 7,2 | 30,63 | 22,4 | 56,05 | 1,14 |
| Bca 62-90 | 4,02 | 1,29 | t. olm. | 14,2 | 7,3 | 26,74 | 22,04 | 54,06 | 1,28 |
| Cca 90-129 | 2,39 | 0,75 | “-----“ | 8,8 | 7,4 | 25,69 | 19,2 | 53,63 | t. olm. |
| Açıq boz-qəhvəyi (şabalıdı) | | | | | | | | | |
| AYaca 0-30 | 6,65 | 2,21 | 0,171 | 4,2 | 7,4 | 30,93 | 21,3 | 58,07 | 1,22 |
| Bca 30-58 | 4,18 | 1,73 | 0,133 | 9,5 | 7,6 | 27,43 | 24,33 | 61,78 | 1,27 |
| B/Cca 58-90 | 3,72 | 0,56 | t. olm. | 12,8 | 7,6 | 24,27 | 18,16 | 49,38 | 1,37 |
| Cca 90-135 | 2,28 | 0,40 | “-----“ | 14,9 | 7,7 | 22,84 | 15,64 | 47,19 | t. olm. |

torpaqəmələgətirən süxurların karbonatlı-gipsli lössəbənzər gillicələrdən təşkil olunması və s. səciyyəvi morfoloji əlamətlərdir. Rəngi üst qatda açıq-şabalıdıdır, alt qatda isə bozumtul-şabalıdı, bozumtul və bozumtul-samanı rəngə çevrilir. Profildə nəzərə çarpan xüsusiyyətlərdən biri də illüvial B qatında çaqıl daşlarının olmasıdır. Qranulometrik tərkib ağır gillicəlidir. Fiziki gilin miqdarı 47,19%-dən 61,78%-ə qədər dəyişməklə profil boyu əvvəlcə yuxarıdan aşağıya doğru artmağa başlayır, sonra isə delüvial mənşəli lössəbənzər gillicələrdə qranulometrik tərkib nisbətən yüngülləşir (Cədvəl 1). Orta illüvial karbonatlı qatın (Bca) bərkiməsi qranulometrik tərkibin ağırlaşması və fiziki gilin maksimum miqdarı (61,78 %) ilə təsdiq olunur.

Boz-qəhvəyi (şabalıdı) torpaqların fiziki-kimyəvi göstəricilərinə nəzər saldıqda görünür ki, qədimdən suvarılan boz-qəhvəyi (şabalıdı) torpaqların üst qatında (AU"aca=0-50 sm) humusun miqdarı 1,82-2,68% arasında dəyişir (Cədvəl 2). Üst yarımmetrlik qatda azotun miqdarı 0,138-0,174% təşkil edir. Profil boyu karbonatların səthdən dərin qatlara yuyulması istər morfoloji təsvir, istərsə də analiz nəticələrindən aydın görünür ki, bu da

uzunmüddətli suvarmanın təsiri ilə izah oluna bilər. Belə ki, əkin qatında $CaCO_3$-ün miqdarı 3,6-4,1% olduğu halda 77-135 sm dərinlikdə onun 10-15%-ə qədər yüksəlməsi müşahidə olunur. Qədimdən suvarılan boz-qəhvəyi torpaqlar yüksək udma tutumuna malik olması ilə fərqlənir. Udulmuş əsasların cəmi 100q torpaqda 27,40-30,47 mq-ekv təşkil. Udma tutumunun yüksək olması həm üst qatda humusun miqdarının (1,82-2,68%) kifayət qədər yüksək olması və profil boyu lil hissəciklərinin miqdarının (21,08-25,77%) digər torpaqlara nisbətən yüksək olması ilə izah etmək olar. pH-ın su məhlulunda kəmiyyəti 7,2-7,5 arasında dəyişməklə bu torpaqlarda zəif qələvi mühit üstünlük təşkil edir.

Fiziki-kimyəvi analiz nəticələrindən göründüyü kimi adi boz-qəhvəyi (şabalıdı) torpaqların üst qatında (AUaca+A/Bca=0-62 sm) humusun miqdarı 1,90-2,88%, ümumi azot 0,148-0,203% təşkil edir. $CaCO_3$-ün miqdarı 5,4-14,2% arasında dəyişməklə maksimum kəmiyyəti orta illüvial qatda (Bca=9,5-14,2%) qeyd olunur. Bu torpaqlar udulmuş əsaslarla kifayət qədər (25,69-30,63 mq-ekv/100q) təmin olunmuşlar. pH su məhlulunda zəif qələvi (7,1-7,4) mühitə malikdir.

Açıq boz-qəhvəyi torpaqların üst qatında (AYaca+Bca=0-58 sm) humusun miqdarı orta hesabla 1,73-2,21% arasında dəyişməklə, alt qatlarda (B/Cca+Cca=58-135 sm) kəskin azalır (0,40-0,56%). Humusun miqdarının belə az olmasını bu torpaqlar formalaşan sahələrdə bitki örtüyünün seyrək olması və üzvi qalıqların quraq yay aylarında sürətlə minerallaşması ilə izah etmək olar. Ümumi azotun miqdarı AYaca+Bca qatında 0,133-0,171% təşkil edir. Gözlənildiyi kimi bu torpaqlar səthdən başlayaraq bütün profil boyu karbonatlıdır.

$CaCO_3$-ün miqdarı profil üzrə 4,2-14,9% arasında dəyişməklə onun maksimum miqdarının (12,8-14,9%) orta və dərin qatlarda toplanması aydın nəzərə çarpır. Bu isə öz növbəsində yaz-payız yağıntılı aylarda karbonatların üst qatlardan nisbətən yuyulması və torpaqəmələgətirən delüvial gillicəli çöküntülərin yüksək karbonatlığı ilə izah olunur. Təsvir etdiyimiz torpaqlarda udulmuş əsasların cəmi 100q torpaqda 22,84-30,93 mq-ekv təşkil edir ki, bunun da ən yüksək miqdarı üst akkumulyativ humus qatında (27,43-30,93 mq-ekv) qeyd olunur. Bu torpaqlar zəif qələvi reaksiyaya malik olub, pH-ın su məhlulunda göstəricisi 7,4-7,7 arasında dəyişir.

## YEKUN

Boz-qəhvəyi (şabalıdı) torpaqların fiziki və kimyəvi göstəricilərinin təhlilindən belə nəticəyə gəlmək olar ki, bu torpaqların münbitliyinin yüksəldilməsi üçün aqrotexniki, aqrokimyəvi və meliorativ tədbirlərin görülməsi lazımdır. Belə ki, sahələr səpindən ən azı 1-1,5 ay qabaq şumlanmalı və hazırlanmalıdır. Şumdan sonra malalama yolu ilə iri kəltənlərin əzilməsi vacibdir. Əkinaltı qatın kipliyini azaltmaq məqsədilə sahədə traktorların keçid sayı azaldılmalı və dərinlik yumşaltması (50-60 sm) aparılmalıdır. Siderat heriklərin tətbiq olunması və 20-25 ton\ha peyin verilməsi lazımdır. Suvarma üsulu və norması dəqiq müəyyən edilməlidir və torpağın kipləşməsinə qarşı müvafiq tədbirlər (dərindən yumşaltma, minimum becərmə və s.) görülməlidir.

## ƏDƏBİYYAT

**Babayev M.P., Cəfərova Ç.M., Həsənov V.H.** (2006) Azərbaycan torpaqlarının müasir təsnifatı. **Bakı, Elm**: 360 s.

**Məmmədov Q.Ş.** (2007) Torpaqşünaslıq və torpaq coğrafiyasının əsasları. **Bakı, Elm**: 664 s.

**Salayev E.M., Babayev M.P., Cəfərova Ç.M., Həsənov V.Q.** (2004) Azərbaycan torpaqlarının morfo-genetik profili. **Bakı, Elm**: 202 s.

**Şəfibəyov Ə.B.** (1964) Torpaq və bitkilərin aqrokimyəvi analiz üsulları. **Bakı, Azərnəşr**: 204 s.

**Бабаев М.П.** (1984) Орошаемые почвы Кура-Араксинской низменности и их производительная способность. **Баку, Элм**: 176 с.

**Муха В. Д. , Муха Д. В. , Ачкасов А. Л.** (2010) Практикум по агропочвоведению. **Москва, Колос**: 367 с.

**Bashirov V.V.** (2009) Correlation Study Between Soil Nutrient Indices and Yield of Wheat and Barley in the Ganjabasar Region of Azerbaijan. International Journal of Soil Science, **Vol. 4, № 4**: pp. 114-122.

**IUSS, ISRIC, FAO.** (2006) World Reference Base for Soil Resources. World Soil Resources Reports **No. 103**. FAO, Rome: pp. 145.

**В.В.Баширов**

**Морфологические Признаки и Основные Физико-Химические Свойства Каштаноземов**

Целью исследований было морфологическая демонстрация профиля под зерновых серо-коричневых почв, распространенных в Гянджа-Казахском регионе и исследование результатов лабораторных анализов основных физико-химических показателей этих почв (гигроскопическая влага, гранулометрический состав, гумус, валовой азот, $CaCO_3$, pH, сумма поглощенных оснований, плотность). На основе исследований этих показателей были предложены агротехнические, агрохимические и мелиоративные меры по улучшению плодородия серо-коричневых почв.

**V.V.Bashirov**

**Morphological Characteristics and Main Physico-Chemical Indices of Kastanozem Profiles**

The objective of this study was to describe morphological characteristics and investigate main physico-chemical indicators (hygroscopic water, soil texture, humus, total nitrogen, $CaCO_3$, pH, base saturation, density) of kastanozem soils used for cereals in Ganja-Gazakh region. To increase the fertility of kastanozem soils the agrotechnical, agrochemical and ameliorative measures were recommended on the basis of soil fertility analysis.

# Gəncənin Bağ və Parklarına Yeni Əkilmiş Bəzək Bitkilərinin Birillik Boy Artımı

**T.H.İsgəndərova**
*Gəncə Dövlət Universiteti, Ş.İ.Xətai pr.187, Gəncə 2000, Azərbaycan, E-mail:* hasanovzm@box.az

**Aparılmış tədqiqatlarla Gəncə şəhərində yeni əkilmiş iynəyarpaqlı və enliyarpaqlı bəzək bitkilərinin, birillik boy artımları əsasında, adaptiv xüsusiyyətləri öyrənilmişdir. Müəyyən olunmuşdur ki, texnogen çirklənməyə daha çox məruz qalmış ərazilərdə bitkilərin boy artımı, təmiz ərazilərlə müqayisədə nisbətən zəif olmuşdur. Bununla belə zoğların yarpaqlanma əmsalı, təmiz ərazilərlə müqayisədə çirklənmə zonasında daha yüksəkdir.**

## GİRİŞ

XX əsrin ortalarından başlayaraq biosferin əsas struktur vahidi olan ekosistemlərə ciddi təhlükə yaradan texnogen çirkləndiricilərin sayı artmış, insanların müdaxiləsi ilə ekosistemlər deqradasiyaya uğramış, meşələrin və yaşıllıqların sahəsi kəskin şəkildə azalmışdır. Bunları nəzərə alaraq BMT-nin "Ətraf Mühit və İnkişaf Proqramı" (YUNEP) çərçivəsində, 1992-ci ildə Rio-de Janeyroda keçirilən konfransda (Rio-92), "Ətraf mühit və inkişaf" üzrə konsepsiya, XXI əsrdə fəaliyyət proqramı kimi bütün dünya ölkələri üçün əsas götürülmüş və "XXI əsr - Ekologiya Əsri" elan olunmuşdur. Bu konsepsiyanın əsas müddəalarından birincisi "İnsanların təbiətlə həmahəng, sağlam və məhsuldar yaşamaq hüququ"na malik olmasıdır. Bununla yanaşı insanların ətraf mühitin qorunmasında maddi və mənəvi məsuliyyət daşıması da bu konsepsiyada öz əksini tapmışdır. Təəssüf ki, müasir dövrdə şəhərlərə əhali axınının güclənməsi, sənayenin intensiv inkişafı şəhər mühitinin məişət, nəqliyyat və sənaye tullantıları hesabına ciddi şəkildə çirklənməsinə səbəb olur. Bundan irəli gələrək bir sıra nüfuzlu mənbələrin (Безуглая, 1980, 1986; Безуглая и др. 1991; Жученко, 2011) verdiyi məlumata görə Yer kürəsində insanla təbiətin disharmoniyası baş vermişdir.

Ümumdünya Səhiyyə Təşkilatının verdiyi məlumatda bildirilir ki, dünyada yaşayış ərazilərinin 70%-i insanların fəal uzunömürlülüyünün aşağı düşməsinə səbəb olur. Bununla belə şəhər əhalisinin sayı durmadan artır. İnsanın istehsal fəaliyyəti ətraf mühitə getdikcə daha güclü təsir göstərir. Yalnız XX yüzillikdə texnogenezin intensivləşdirilməsi ətraf mühitə çıxarılan çirkləndirici maddələrin də sürətli artımına şərait yaratmışdır. Ətraf mühitin yüksələn xətlə gedən texnogen çirklənmə şəraitində aktual problemi, fitoindikasiya vasitələri ilə ekoloji monitorinqlər sisteminin və mühityaxşılaşdırıcı fitotexnologiyalarin işlənməsi və təkmilləşdirilməsidir. Ümumdünya Səhiyyə Təşkilatının verdiyi məlumata görə dünyada 2 mlrd nəfərdən çox əhali qəbul ediləcək qatılıq səviyyəsindən yüksək olan çirklənmə havasında yaşayır.

Şəhər yaşıllıqlarının ətraf mühitin saflaşdırılmasında, özünəməxsus mikroiqlim şəraitinin yaradılmasında, texnogen çirkləndiricilərin udulmasında, insanların mənəvi-psixoloji durumunun yaxşılaşdırılmasında rolu birmənalıdır. Dünya alimlərinin (Rumelhart, 1989; Розенберг, Рянский, 2005; Казанский, 2006; Бухарина, Туганаев, 2007; Дубовик, 2011; Рабинович, 2011) apardığı tədqiqatlarla abiotik mühit amillərinin biosfer səviyyəsində bioloji nəzarətinin həyata keçirilməsinin vacibliyi müəyyən olunmuşdu. Bu konsepsiyaya əsasən mühitin biotik komponentlərinin məhv edildiyi böyük şəhərlərdə və iri sənaye müəssisələrində biotanın, mühitin nisbi stabilliyini saxlamaq imkanları zəifləyir və nəticədə biosferin yaralı nöqtələri çoxalır. Ətraf mühitin sağlamlaşdırılması sahəsində yaşıllıqların əvəzsiz rolu nəzərə alınmaqla, şəhər və qəsəbələrdə istifadə edilən bitkilərin seçilməsi, taksonomik tərkibinin zənginləşdirilməsi və onların həyat fəaliyyətlərinin yüksək səviyyədə saxlanılması böyük aktuallıq kəsb edən məsələlərdəndir.

## MATERİAL VƏ METODLAR

Son illərdə respublikamıza bir sıra xarici ölkələrdən kütləvi şəkildə müxtəlif növ bəzək ağac və kol bitkiləri gətirilir. Bu bitkilərin əksəriyyəti yerli şəraitə uyğunlaşa bilmədiyindən tədricən məhv olub sıradan çıxır.

Davamlı yaşıllıq sahələrinin yaradılması üçün bitki çeşidləri düzgün seçilmədikdə, onların bioekoloji xüsusiyyətləri yerli bitmə şəraitinə uyğun olmadıqda yaşıllıqlar tez bir zamanda məhv olur və ya inkişafdan qalırlar.

Tədqiqat materialı olaraq çılpaqtoxumlu (*Angiospermae*) və örtülütoxumlu (*Comnaspermae*) bitkilərdən müxtəlif fəsilələrə, cinslərə və növlərə aid bitkilər istifadə olunmuşdur.

Zoğların illik boy artımı, vegetasiyanın sonunda, hər bitkidən müxtəlif ölçülü 10 ədəd birillik zoğ olmaqla uçot üçün nişanlanmış və

onların uzunluqları dəqiqliklə ölçülərək, bir zoğun orta uzunluğu, diametri və yarpaq sayı əsasında müəyyənləşdirilmişdir (Русаков, 2007).

Tədqiqatın proqramında nəzərdə tutulan məsələlər şəhərin hər iki inzibati-ərazi bölgəsində (Nizami və Kəpəz rayonları) mövcud əkililərin şərti bölgüsü (stasionar nöqtələr) ilə həyata keçirilmişdir.

Alınmış eksperimental tədqiqat materialları riyazi-statistik metodlar (Доспехов, 1985) əsasında işlənmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Hər zaman aktuallığını saxlayan ətraf mühitin davamlı inkişafı naminə idarə edilməsi, ilk növbədə onun keyfiyyəti haqqında dəqiq və dolğun məlumatın alınmasına, ekoloji monitorinqlərin mütəmadi həyata keçirilməsinə əsaslanır. Bu, ilk növbədə, canlıların, o cümlədən bitki aləminin öyrənilməsini, onların müxtəlif amillərin təsiri nəticəsində dəyişməsinin qiymətləndirilməsini tələb edir. Ətraf mühitdə amillərin bitkilərə təsiri haqqında məlumatların toplanması eyni zamanda bu canlılar vasitəsi ilə ətraf mühitin keyfiyyəti haqqında məlumat toplamaq üçün də şərait yaradır. Ətraf mühitin keyfiyyətinin qiymətləndirilməsi zamanı mühitdə bir çox amillərin mövcud olması müəyyən edilmişdir.

Bitkilər təkamül prosesində ətraf mühit şəraitinə uyğun olan xassə və nişanələr qazanmış, müəyyən adaptativ istiqamət – təbii ehtiyatlardan səmərəli istifadə xüsusiyyətləri əxz etmişlər. Təəssüf ki, bir çox mənbələrdə də göstərildiyi kimi (Усманов и др., 2001; Пашкина, 2002; Сидорович и др., 2004; Мартынова, 2009; Калашников, Железова, 2010; Кавеленова, 2006; Бухарина, 2004; 2007; 2009; Зубалий, 2011 və b.) insanların kortəbii fəaliyyətinin nəticəsi kimi meydana çıxan mühit çirklənməsinə qarşı bitkilərdə xüsusi adaptativ xarakter formalaşa bilməmişdir. Məhz bu səbəbdən texnogen çirklənmə zonasında becərilən bitkilərdə boy durğunluğu, xloroz xəstəliyi və d. təbii stresslər baş verə bilir. Eyni zamanda şəhər mühiti şəraitində istilik və işıq rejiminin dəyişməsi də bitkilərin boy və inkişafına ciddi təsir göstərir.

Bu məsələlərin araşdırılması ilə bağlı şəhərin müxtəlif məntəqələrində əkilmiş yeni bəzək bitki cinslərinin hərəsindən bir ədəd növ üzərində apardığımız araşdırmaların nəticəsi 1 saylı cədvəldə verilir.

Cədvəldən göründüyü kimi, iki rayon ərazisində 4 stasionar məntəqədə becərilən bəzək bitkiləri müxtəlif boy və inkişafa malikdirlər. Belə ki, Xan bağında əkilmiş iynəyarpaqlı-lardan normal boy və inkişafa Eldar şamı, Himalay sidri, sabin (kazak) ardıcı, həmişəyaşıl sərv, lason sərvpəri və şərq tuyası malikdir. Nisbətən zəif inkişafa tikanlı küknar, giləmeyvə qaraçöhrə və kriptomeriya bitkilərində rast olunur. Ən zəif boy isə ispan ağ şamında müşahidə olunmuşdur. Bu növün bağda əkilmiş 6 ədəd nümunəsindən heç biri normal inkişaf edə bilməmişdir. Zənnimizlə bu həmin ağacların yerinin düzgün seçilməməsi (yaşlı, möhtəşəm çətirli Himalay sidrinin altında əkilib) ilə izah olunur.

Həmin bağda əkilmiş enliyarpaqlı bitkilərin hamısı əsasən normal boy və inkişafa malik olmuşdur. Onlardan dəfnə, iriçiçəkli maqnoliya, dişli fotiniya, sivriyarpaqlı pırkalı, yapon gərməşovu, sürünən skimmiya, xırdayarpaqlı dovşanalması daha yüksək boy artımına malik olmuşdur. Onlarda zoğların illik boy artımı 11,5-11,8 sm arasında tərəddüd edir. Nizami rayonu 2-ci stasionar məntəqə (H.Əliyev parkının cənub hissəsi) iynəyarpaqlı və enliyarpaqlı bitkilərin hamısı yüksək boy artımına malik olmuşlar. Bu hal həmin bitkilərin təmiz hava mühiti və yüksək diqqət və aqrotexniki qulluq şəraitində olmaları ilə izah edilir.

Kəpəz rayonu ərazisində becərilən dekorativ bitkilərin hər iki qəbildən (iynəyarpaqlı və enliyarpaqlılar) olan nümayəndələri nəzərə çarpacaq dərəcədə boy artımı verməmişdir. Bu zaman texnogen çirklənmə mənbəyindən bir qədər aralı yerləşən Füzuli və F.Əmirov parklarında becərilən iynəyarpaqlı bitkilər nisbətən normal (8,9-11,7 sm) boy vermişdir. Texnogen çirklənmə mənbəyinə yaxın olan ərazidə (N.Gəncəvi məqbərəsi ərazisi) isə bu göstərici 6,4-7,2 sm təşkil edir. Müvafiq olaraq bu zaman yarpaq sayı və zoğların yoğunlaşmasında da xeyli fərq olduğu nəzərə çarpır. Eyni zamanda bu ərazidə əkilən qızılgül kollarında da artım bir o qədər güclü olmamışdır. Zoğların yarpaqlarla örtülmə – yarpaqlanma əmsalının (YƏ) təhlili çox maraqlı məsələləri ortaya çıxartdı. Belə ki, bütövlükdə iynəyarpaqlı bitkilərin YƏ enliyarpaqlı bitkilərlə müqayisədə yüksəkdir. Bu təqribən 1:7,72 nisbətində fərqlidir. Eyni zamanda məntəqələr üzrə də həm iynə və həm də enliyarpaqlılar arasında YƏ göstəricisi xeyli fərqlidir. Belə ki, daha çox çirklənməyə məruz qalan Nizami məqbərəsi ərazisində iynəyarpaqlı bitkilərdə YƏ 9,09 ədəd/sm olduğu halda həmin rayonun nisbətən təmiz bölgəsində (stasionar 2) bu 7,0 ədəd/sm təşkil edir.

Göründüyü kimi texnogen çirklənmə zonasında boy artımı zəif olsa da onların yarpaqlanma səviyyəsi normaldır. Zoğların diametr göstəriciləri üzrə isə məntəqələr arasında nəzərəçarpacaq fərqlərə rast gəlinmir.

Bütövlükdə müqayisəli təhlil nəticələrindən göründüyü kimi ətraf mühitin daha çox çirkləndiyi Kəpəz rayonu, xüsusilə də 1 saylı stasionar (Nizami məqbərəsi) ərazisində bütün bitkilər üzrə illik boy artımı xeyli zəif olmuşdur (Şəkil 1).

**Cədvəl 1.** Zoğların illik boy artımı

| Sıra sayı | Cins və növ | Zoğların orta uzunluğu, sm | Zoğların orta diametri, sm | Zoğda yarpaqların orta sayı, ədəd | Zoğların yarpaqlanma əmsalı, ədəd |
|---|---|---|---|---|---|
| | **Nizami rayonu – Stasionar 1 (Xan bağı)** | | | | |
| | **İynəyarpaqlılar** | | | | |
| **1** | *Pinus eldarica* | 12,8±0,013 | 0,21±0,007 | 74,0±2,10 | 5,8 |
| **2** | *Picea pungens* | 9,5±0,2 | 0,22±0,005 | 91,3±1,05 | 9,6 |
| **3** | *Cedrus deodara* | 11,4±0,14 | 0,18±0,0088 | 64,0±1,86 | 5,6 |
| **4** | *Juniperus sabina* | 13,8±0,14 | 0,27±0,021 | 61,6±1,48 | 4,5 |
| **5** | *Abies concolar* | 2,2±0,07 | 0,13±0,008 | 22,0±1,03 | 10,0 |
| **6** | *Taxus baccata* | 7,3±0,17 | 0,22±0,007 | 37,0±0,35 | 5,1 |
| **7** | *Cupressus sempervirens* | 12,2±0,13 | 0,17±0,007 | 72,1±1,76 | 5,9 |
| **8** | *Chamaecyparis lawsoniana* | 15,8±0,009 | 0,16±0,007 | 79,4±2,12 | 5,0 |
| **9** | *Criptameria japonica* | 8,2±0,14 | 0,14±0,01 | 38,6±1,08 | 4,7 |
| **10** | *Thuya orientalis* | 13,8±0,075 | 0,12±0,006 | 82,9±1,60 | 6,0 |
| | **Orta** | 10,7 | 0,18 | 62,3 | 5,8 |
| | **Enliyarpaqlılar** | | | | |
| **1** | *Magnolia grandiflora* | 9,6±0,11 | 0,21±0,011 | 3,7±0,40 | 0,38 |
| **2** | *İlex crenata* | 12,5±0,11 | 0,16±0,008 | 15,6±0,96 | 1,25 |
| **3** | *Camellia japonica* | 8,2±0,16 | 0,18±0,008 | 7,8±0,27 | 0,95 |
| **4** | *Euonymus japonicus* | 12,6±0,15 | 0,23±0,009 | 9,3±0,73 | 0,74 |
| **5** | *Cotoneaster microphyllus* | 11,5±0,086 | 0,12±0,007 | 12,9±0,64 | 1,12 |
| **6** | *Mahonia aquifolium* | 16,3±0,14 | 0,14±0,01 | 4,2±0,56 | 0,26 |
| **7** | *Photinia serrulata* | 15,5±0,12 | 0,19±0,03 | 17,5±0,96 | 1,13 |
| **8** | *Daphne cneorum* | 18,8±0,11 | 0,12±0,006 | 10,2±0,21 | 0,54 |
| **9** | *Skimmia repens* | 12,7±0,18 | 0,10±0,01 | 14,9±0,77 | 1,17 |
| **10** | *Symphoricarpus orbiculatus* | 7,3±0,12 | 0,12±0,006 | 6,2±0,24 | 0,85 |
| | **Orta** | 12,5 | 0,16 | 10,2 | 0,82 |
| | **Nizami rayonu – Stasionar 2 (H.Əliyev parkı)** | | | | |
| | **İynəyarpaqlılar** | | | | |
| **1** | *Pinus eldarica* | 14,1±0,12 | 0,23±0,009 | 68,9±1,8 | 4,9 |
| **2** | *Cupressus sempervirens* | 12,8±0,11 | 0,16±0,008 | 76,2±2,2 | 5,9 |
| **3** | *Picea pungens* | 12,2±0,012 | 0,21±0,011 | 104,4±1,3 | 8,6 |
| **4** | *Chamaecyparis lawsoniana* | 16,6±0,013 | 0,17±0,008 | 76,7±1,2 | 4,6 |
| **5** | *Thuya orientalis* | 15,2±0,15 | 0,14±0,0095 | 94,3±1,05 | 6,2 |
| | **Orta** | 14,2 | 0,18 | 84,1 | 5,9 |
| | **Enliyarpaqlılar** | | | | |
| **1** | Eucalyptus viminalis | 21,2±0,13 | 0,26±0,007 | 12,2±0,96 | 0,6 |
| **2** | Magnoliya soulangina | 14,4±0,13 | 0,24±0,011 | 7,3±0,51 | 0,5 |
| **3** | Euonymus japonica | 13,9±0,11 | 0,22±0,007 | 11,1±1,04 | 0,8 |
| | **Orta** | 16,5 | 0,24 | 10,2 | 0,62 |
| | **Kəpəz rayonu – Stasionar 1 (Nizami məqbərəsi ərazisi)** | | | | |
| | **İynəyarpaqlılar** | | | | |
| **1** | *Pinus eldarica* | 7,2±0,13 | 0,17±0,008 | 62,4±1,4 | 8,7 |
| **2** | *Cupressus sempervirens* | 6,4±0,14 | 0,13±0,008 | 61,2±0,92 | 9,56 |
| | **Orta** | 6,8 | 0,15 | 61,8 | 9,09 |
| | **Enliyarpaqlılar** | | | | |
| **1** | *Roza rubrifolia* | 9,6±0,11 | 0,22±0,001 | 5,9±0,64 | 0,6 |
| | **Kəpəz rayonu – Stasionar 2 (Füzuli və F.Əmirov parkları)** | | | | |
| | **İynəyarpaqlılar** | | | | |
| **1** | *Picea pungens* | 8,9±0,11 | 0,21±0,01 | 66,8±1,2 | 7,5 |
| **2** | *Chamaecyparis lawsoniana* | 11,7±0,11 | 0,14±0,01 | 66,8±1,2 | 5,7 |
| **3** | *Cupressus sempervirens* | 10,4±0,15 | 0,13±0,008 | 76,8±1,9 | 7,4 |
| **4** | *Thuya orientalis* | 9,9±0,13 | 0,11±0,0065 | 72,1±1,8 | 7,3 |
| **5** | *Juniperus horizontalis* | 11,1±0,1 | 0,14±0,01 | 93,6±1,22 | 8,4 |
| **6** | *Cedrus deodara* | 8,9±0,11 | 0,13±0,009 | 52,6±1,4 | 5,9 |
| | **Orta** | 10,15 | 0,14 | 71,45 | 7,0 |
| | **Enliyarpaqlılar** | | | | |
| **1** | *Euonymus japonicus* | 10,2±0,12 | 0,19±0,009 | 8,6±0,9 | 0,8 |
| **2** | *Buxus sempervirens* | 11,8±0,11 | 0,22±0,007 | 26±0,09 | 2,2 |
| | **Orta** | 11,0 | 0,205 | 17,3 | 1,57 |





**Şəkil 1.** Bitkilərin illik boy artımı

Şəkildən göründüyü kimi, iynəyarpaqlı bitkilərin Nizami rayonu ərazisində illik boy artımı 10,4-14,2 sm olduğu halda bu göstərici Kəpəz rayonu ərazisində 6,8-10,5 sm təşkil edir. Enliyarpaqlı bitkilər də həmçinin Nizami rayonu ərazisindəki məntəqələrdə, müvafiq olaraq 12,5-16,5 sm, Kəpəz rayonu ərazisindəki məntəqələrdə isə 9,6-11,0 sm illik boy artımı vermişdir.

Qeyd olunanlar bir daha onu göstərir ki, bitkilərin həyat qabiliyyətinin tənzimlənməsində ətraf mühitin təmizliyi əsaslı rol oynayır. Başqa sözlə texnogen çirklənmə, istilik və işıq rejimin pozulması, qeyri-qənaətbəxş texnoloji qulluq şəraitində bitkilərdə böyümə və inkişafla bağlı nəzərəçarpacaq dəyişikliklər baş verə bilir.

## ƏDƏBİYYAT

**Безуглая Э.Ю. (**1980) Метеорологический потенциал и климатические особенности - загрязнения воздуха городов. Л.: Гидрометеоиздат, 184 с.

**Безуглая Э.Ю. (**1986) Мониторинг состо-яния загрязнения атмосферы в городах. Л.: Гидрометеоиздат, 200 с.

**Безуглая Э.Ю., Расторгуева Г.П., Смирнова И.В.** (1991) Чем дышит промышленный город. Л.: Гидрометеоиздат, 255 с.

**Бухарина И.Л., Туганаев В.В.** (2007) Ботанические исследования в Удмуртском государственном университете. Изв. Саратовского научного центра РАН, **9(7):** 96-106.

**Доспехов Б.А**. (1985) Методика полевого опыта. Колос: 416 с.

**Дубовик В.А.** (2011) Средеулучшающие технологии, фитодизайн и фитоиндикация. Субтропическое и декоративное садоводство. ВНИИЦ и СК, Российской АСХН, **45:** 270-273.

**Жученко А.А. мл., Учаева О.С.** (2011) Роль Coffea Arabica L. в улучшении среды обитания человека. Субтропическое и декоративное садоводство. ВНИ ИЦ и СК, Российской

АСХН, **45:** 282-289.

**Искендерова Т.Г., Гасанов З.М.** (2011) Новые для условий Гянджи (Азербайджан) декоративные растения. Субтропическое и декоративное садоводство. ВНИИЦ и СК, Российской АСХН, **45:** 53-56.

**Искендерова Т.Г., Гасанов З.М.** (2012) Анализ жизненного состояния новоинтродуцированных декоративных растений в г. Гянджи. Сборник научных трудов Национального ботанического сада им. М.М. Гришко НАН Украины, **1:** 139-146.

**Казанский А.Б.** (2006) Феномен Геи Джеймса Лавлока. www.evol.nw.ru.

**Рабинович А.М.** (2011) Комплексное использование полезных свойств растений, улучшающих среду обитания и здоровье человека. Субтропическое и декоративное садоводство. ВНИИЦ и СК, Российской АСХН, **45:** 303-310.

**Розенберг Г.С., Рянский Ф.Н.** (2005) Теоретическая и прикладная экология. Нижневартовск, 294 с.

**Русаков Е.Г.** (2007) Методы изучения флоры и растительности. Астрахань: Изд. дом «Астраханский университет», 55 с.

**Rumelhart D.E.** (1989) "The Architecture of Mind: A Connectionist Approach", in M. Posner (ed.) Foundations of Cognitive Science, Cambridge, MA: MIT Press, p. 133-159.

**Т.Г. Искендерова**

### Годовой Прирост Декоративных Растений, Нововысаженных в Сады и Парки г. Гянджи

Целью исследований является изучение адаптивных особенностей декоративных растений на основании годового прироста побегов. Анализы полученных данных показали, что в условиях техногенного загрязнения атмосферы прирост побегов значительно (на 30-35 %) отстает от тех же растений, выращенных в зоне относительно чистой атмосферной среды. Вместе с тем установлено, что листовой индекс побегов в зоне техногенного загрязнения выше, чем побегов растений в чистой зоне.

**T.G.Isgandarova**

### Annual Growth of New Introduction Ornamental Plants in Gardens And Parks of Ganja

We present the results of research on identifying adaptive features of new introduction in Ganja, coniferous and deciduous ornamental plants on the basis of one-year increase. Found that in the area of industrial pollution growth of shoots significantly (30-35%) lags behind the plants cultivated in the area of clean atmospheric environment. However, in the air pollution area of leafy shoots (leaf index), greatly exceeds the clean zone of plants.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 85-89 (2012)*

# Разработка Лечебных Сиропов на Основе Солодки Для Коррекции Углеводного Обмена При Сахарном Диабете

**П.М. Велиев**
*Азербайджанский Медицинский Университет, ул. Бакиханова 23, Баку AZ1022, Азербайджан,*
*E-mail: mahbubav_amu@rambler.ru*

**В данной статье впервые представлен научно-обоснованный материал по разработке лечебных сиропов на основе солодки в комбинации девясила, винограда, фасоли с противодиабетической активностью. Разработан состав многокомпонентного сбора, из которого получен водный, густой и сухой экстракты, а затем с использованием сорбита и ксилита приготовлены сиропы. Отдельно проведено нормирование сиропов с утверждением спецификации. Изучены токсико-фармакологические свойства разработанных сиропов с подробным обоснованием их противодиабетических свойств.**

## ВВЕДЕНИЕ

В настоящее время сахарный диабет (СД) занимает третье место среди непосредственных причин смерти после сердечнососудистых и онкологических заболеваний, поэтому решение вопросов, связанных с этим заболеванием, во многих странах мира является задачей поставленной на государственный уровень.

Главный эндокринолог Министерства здравоохранения Азербайджана профессор Рафик Мамедгасанов, привел такие данные: сейчас во всем мире этим заболеванием страдают более 250 миллионов людей. Делается и такой неутешительный прогноз, что к 2025 году количество заболевших возрастет до 386 миллионов.

Председатель научного общества эндокринологов Азербайджана, профессор Валех Мирзазаде отметил, что если не предотвратить стремительный рост этого заболевания, к 2190 году население мира будет подвержено этой болезни. Поэтому все попытки по поиску и разработке лекарственных средств, направленных на профилактику и лечение сахарного диабета, является чрезвычайно полезным и актуальным.

Литературные данные свидетельствуют о том, что содержащиеся в корнях солодки, девясила, в гребнях винограда, стручках фасоли (Велиева и др., 2004) фармакологически активные вещества, способны повышать эффективность противодиабетических средств.

**Целью** настоящей работы явилась разработка комплексного состава лечебного сиропа на основе солодки с противодиабетических активностью и его фармакологическое изучение.

**Материалы и методы исследования.** В качестве объектов исследования использовались: сухие и густые экстракты солодки, девясила, винограда и фасоли.

Анализ лекарственного растительного сырья и экстрактов проводили по методам ГФ СССР X и ГФ СССР XI издания.

При изучении влияния вспомогательных веществ на органолептические и микробиологические показатели качества лечебных сиропов использовались в виде корригентов: лимонная кислота и ванилин, а в качестве консервантов: бензойная и сорбиновая кислоты.

Микробиологическую стабильность сиропов изучали способами, рекомендуемыми ГФ СССР XI. Результаты антимикробной активности в отношении грамположительных коков, энтеробактерий, спорообразующие бактерии в сиропах выявляли без присутствия консервантов.

Важным моментом при этом, является выбор основы. Известно, что антидиабетические сиропы требуют в качестве основы использовать сорбит, ксилит, которые в массе должны составлять 60%, а количество вводимых лечебных веществ должны быть 10% от массы сиропа.

В качестве препаратов сравнения использовали: сиропы из экстрактов указанных растений и акарбоза, а также танакан в виде раствора для приема во внутрь.

Влияние лечебного сиропа на уровень глюкозы крови исследовали глюкозооксидазным методом, используя наборы: «глюкоза ФКД» с измерением на спектрофотометре СФ-46 (Россия).

Механизм антидиабетического действия препарата изучали на шести кроликах породы «Шиншилла» массой 4,0-4,5 кг, и 20 белых беспородных крысах-самцах массой 200-205 г.

**Результаты исследования и обсуждение.** С целью создания эффективных лечебных противодиабетических сиропов нами были приняты во внимание ранее исследованные научные работы (Велиева и др., 2006), касательно разработки лекарственных форм, в том числе и сиропов.

| **Cədvəl 2.** Hamiləliyin nəticəsinin təhlili | | |
|---|---|---|
| **Hamiləliyin nəticəsi** | **I (əsas); p=83** | **II (kontrol); p=44** |
| Vaxtında olan doğuşlar | 39 (47%)* | 42 (95,5%) |
| Vaxtındanqabaq doğuşlar | 44 (53%)* | 2 (4,5%) |
| Planlı kesar kəsiyi | 9 (10,6%) | 5 (11%) |
| Təxirəsalınmaz kesar kəsiyi | 10 (12,8%) | 2 (4,5%) |
| ***p<0,05** – kontrol qrupla müqayisədə fərqin etibarlılığı | | |

| **Cədvəl 3.** Müayinə qruplarında dölün hipoksiyasının tezliyi | | |
|---|---|---|
| **Dölün hipoksiyası** | **I (əsas); p=83** | **II (kontrol); p=44** |
| Xronik hipoksiya | 23 (27,7%)* | 2 (4,5%) |
| Kəskin hipoksiya | 4 (4,3%) | - |
| ***p<0,05** – kontrol qrupla müqayisədə fərqin etibarlılığı | | |

Ən çox rast gələn ağırlaşma əsas qrupda 55% (46 hamilə) pasiyentdə dölyanı suların vaxtındanqabaq axması olmuşdur, kontrol qrupda isə bu ağırlaşma 29,5% (13 hamilə) halda müşahidə olunmuşdur. Kontrol qrupla müqayisədə əsas qrupun hamilə qadınlarında dölün kəskin və xronik hipoksiyasının yüksək tezliyi diqqəti cəlb edir. Bunu o fakt izah edir ki, urogenital infeksiya olduqda plasentar çatışmamazlıq şəklində hamiləliyin ağırlaşmalarının inkişaf riski artır və bunun nəticəsində dölün bətndaxili hipoksiyası nkişafı edir. Dölün kəskin hipoksiyası əsas qrupun pasiyentlərində qeyd olunmuş və 4,3% (4 hamilə) təşkil etmişdir. Kontrol qrupda bu ağırlaşma rast gəlməmişdir. Kontrol və əsas qrupun analarında doğuşdan sonrakı dövr eyni sürməmişdir. Kontrol qrupda doğuşdan sonrakı dövrün ağırlaşmaları müşahidə olunmamışdır. EVI olan hamilə qadınlar qrupunda anaların 91,5%-də (75 hamilə) doğuşdan sonrakı dövr ağırlaşmalarsız sürmüşdür, halbuki 8,5% (7 hamilə) qadında uşaqlığın subinvolyusiyası baş vermişdir. Əsas qrupda kontrol qrupla müqayisədə yeni doğulmuşlar arasında xəstələnmənin daha yüksək tezliyi nəzərə çarpmışdır – 98% (42 yeni doğulmuş) hadisədə yeni doğulmuşlar sağlam olmuşlar (cədvəl 3).

EVI olan analardan doğulan uşaqlar 21% (17 yenidoğulmuş) sağlam olmuşlar, qalan 79%-in (66 yenidoğulmuş) xəstəliyi vardır. Bu qrupun yeni doğulmuşlarının xəstələnməsinin strukturunda 21%(17 yenidoğulmuş) dölün hipotrofiyası, 17% (15 yeni doğulmuş) – pnevmoniya, 13% (11 yeni doğulmuş) konyunktivit, 13% (11 yeni doğulmuş) RDS, 11% (9 yenidoğulmuş) aspirasion sindrom, 4% (3 yeni doğulmuş) - meningit üstünlük təşkil etmişdir. Bətndaxili infeksiya (BDI) yeni doğulmuşların 29%-də (24 yeni doğulmuş) inkişaf etmişdir. Xronik hipoksiya EVI olan analardan doğulmuş uşaqların 27,7%-də (23 yeni doğulmuş) və yalnız sağlam analardan doğulmuş uşaqların 4,5%-də (2 yeni doğulmuş) təyin edilmişdir. Yuxarıda qeyd olunan məlumatlar anamnez məlumatları, hamiləlik və doğuş zamanı baş verən ağırlaşmalarla sonradan meydana çıxan bətndaxili yoluxmanın təzahürləri arasında əlaqə olduğunu güman etməyə əsas verir.

## ƏDƏBIYYAT


**Амвросьева Т.В.** (2001) Современное состояние проблемы энтеровирусных инфекций человека. Медицина, **№2:** 39-41.

**Лозовская Л.С., Покрышкина У.Л., Бочаров Е.Ф., Мелешина О.Б.** (2004) Диагностика энтеровирусной инфекции методами кариологического и иммуннофлюоресцентного анализа. Метод. Рекомендации. М: Медицина, 14 с.

**Глинских Н.П., Пацук Н.Б.** (2001) Перинатальные вирусные инфекции (этиопатогенез, диагностика, лечение и профилактика). Екатеринбург: ЕНИЖИ; АМБ, 128 с.

**Самойлова А.В.** (2008) Внутриутробная инфекция в структуре заболеваемости и смертности новорожденных. Мат-лы II регион, научного форума «Мать и дитя». Сочи: с. 252-253.

**Шабалов, Н.П.** (2000) Проблемы классификации внутриутробных инфекций. Педиатрия, **№1:** 87-91.

**Кицак В.Я.** (2004) Вирусные инфекции беременных: патология плода и новорожденных. Кольцово: ЗАО «Вектор-Бест», с. 22-57.

**Cowan F.M.** (2001) Developing preventative strategies in Europe. Int. J. Epidemiol., **30(6):** 588-58.

**Гейдарова Н.Ф.**

**Особенности Течения Беременности у Женщин с Энтеровирусной Инфекцией**

Одним из наиболее частых осложнений беременности у пациенток с энтеровирусной инфекций была угроза прерывания беременности. В контрольной группе однократно в течение беременности угроза прерывания наблюдалась у 34,0% пациенток, тогда как у пациенток основной группы угроза носила рецидивирующий характер, и наблюдалась в 68,1%. Диагноз плацентарной недостаточности был установлен у 42,6% пациенток с энтеровирусной инфекцией, что достоверно превышает частоту в контрольной группе 2,3%. Увеличение частоты встречаемости инфекции мочевыводящих путей и плацентарной недостаточности непосредственно являются факторами, способствующими реализации внутриутробного инфицирования. Наиболее частым осложнением было преждевременное излитие вод у 55,0% беременных основной группы, в контрольной группе данное осложнение наблюдалось у 29,5% случаев. Приведенные выше данные позволяют предполагать взаимосвязь между анамнестическими данными, осложнениями во время беременности и во время родов, с последующим проявлением внутриутробного инфицирования.

**Heydarova N.F.**

**Features of the Current of Pregnancy in Women with the Enterovirus Infection**

One of the most frequent complications of pregnancy patients with enterovirus infections had a threat of interruption of pregnancy. In control group unitary during pregnancy interruption threat was observed at 34.0% of patients whereas at patients of the basic group threat carried repetition character, and observed in 68.1%. The diagnosis of placentary insufficiency has been established at 42.6% of patients with enterovirus an infection, that authentically exceeds frequency in control group of 2.3%. Increase in frequency of occurrence of an infection to deduce urine ways and placentary insufficiency directly are the factors promoting realisation prenatal infected. The most frequent complication was premature pour waters at 55.0% of pregnant women of the basic group, in control group the given complication was observed at 29.5 % of cases. The data cited above allow assuming interrelation between anamnesis data, complications during pregnancy and during sorts, with the subsequent display pre-natal infected.

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 114-117 (2012)

# Qafqazda *Rosa myriacantha* DC. növünün yayılmasına dair qeydlər

**Isgəndərov A.T., Qafarova O.O.**
*AMEA Botanika İnstitutu, Badamdar şossesi 40, Bakı AZ 1073, Azərbaycan,*
*E-mail: ofeliya05.75@rambler.ru*

**Fransa florasından təsvir olunmuş *Rosa myriacantha* DC. (De Candolle, 1805) növünün Qafqaz florasında yayılması tədqiqatçılar tərəfindən birmənalı qarşılanmamışdır. Qafqaz florasından o cümlədən Azərbaycanın müxtəlif bölgələrindən toplanmış faktiki materiallara, bizim təbiətdə və kulturada tədqiqat və müşahidələrimizə əsaslanaraq müəyyən edilmişdir ki, *Pimpinellifoliae* DC. seksiyasında sərbəst növ kimi təmsil olunmaqla Qafqazda o cümlədən Azərbaycan florasında *Rosa tschatyrdagi* Chrshan. deyil məhz *Rosa myriacantha* DC. növü yayılmışdır.**
***Açar sözlər:*** *Rosa myriacantha*, Qafqaz, Azərbaycan, yayılma.

## GİRİŞ

İki əsr əvvəl Dekandolun (De Candolle, 1805) Fransa florasından təsvir etdiyi Rosa myriacantha DC. növünün taksonomiyasına olan münasibət tədqiqatçılar tərəfindən birmənalı olmamışdır. Bəzi floraçılar bu növün sərbəst növ olmasına şübhə etmiş, onu *Rosa pimpinellifolia* L. və yaxud *Rosa spinosissima* L. növlərinin növmüxtəlifliyi kimi qəbul etmişlər (Seringe, 1825; Lede bour, 1844; Regel, 1878; Lonacevski, 1910, 1913; Boulanger, 1935; Гроссгейм, 1934 və s.).

Digər qrup klassik tədqiqatçılar Dekondola həmfikir olmuş və *R. myriacantha*-nı sərbəst növ kimi qəbul etmişlər (Marschall Bieberstein, 1918; Borbas, 1880; Юзепчук, 1941; Сосновский, 1943 və s.).

*Rosa* L. cinsinin ən mahir tədqiqatçısı sayılan Krepen (Crepin, 1880, 1882) belə R.myriacantha haqqında ardıcıl fikir söyləməmiş, ona gah sərbəstlik vermiş, gah da *R.spinosissima* növünün növmüxtəlifliyi kimi qəbul etmişdir.

Buassye (Boissieri, 1972) isə *R. spinosissima* L. və *R. myriacantha* DC. növlərini *R.pimpinellifolia* L. növü ilə eyniləşdirir.

V.G.Xrjanovskinin (1953) *R.myriacantha* DC. növü haqqında tənqidi qeydləri çixdıqdan sonra düşünmək olardı ki, artıq bu növ ətrafında gedən diskusiyaya son qoyuldu. O, faktiki materiallara istinad edərək *Pimpinellifoliae* DC. seksiyasında *R.myriacantha*-nın sərbəst növ olmasına şübhə etmir. Müəllif məqalədə qarşısına tamam başqa məqsəd qoymuşdur, SSRİ-n ərazisində o cümlədən Krım və Qafqazda *R. myriacantha* DC. növünə rast gəlinirmi? Müəllif yazır: "1951-ci ildə bizə Krım yaylaqlarından adətən *R. myriacantha* DC. növü kimi göstərilən qızılgülləri biləvasitə təbiətdə öyrənmək imkanı yarandı. Bu qəbildən olan növün çoxsaylı fərdlərini eləcədə Nikita Botanika bağında və V.L.Komarov adına Botanika İnstitutunda olan herbariləri gözdən keçirdikdən sonra belə nəticəyə gəldik, ki Krım bitkiləri Qəbri Avropadaki *R. myriacantha* DC. növünə uyğun gəlmir. Fransanın cənubunda Monpele şəhəri ətrafından təsvir olunmuş *R.myriacantha* DC. növü ilə SSRİ Elmlər Akademiyası Botanika Institutunun ümumi herbarisində eyni növ kimi adlandırılan Krım bitkilərini müqayisə edərkən müəyyən etdik ki, bu bitkilər əsaslı olaraq fərglənirlər və heç vaxt eyni növə mənsub ola bilməzlər". Beləliklə, Xrjanovski Krım florasından toplanmış faktiki materiallara əsasən elm üçün yeni olan *Rosa tschatyrdagi* növünün təsvirini verir. Qafqaz florasından olan materiallara baxarkən onların Qərbi Avropa növünə tam oxşar olmasına şübhə ilə yanaşır. Eyni zamanda Xrjanovski göstərir ki, qafqaz materiallarını *R. tschatyrdagi* ilə də eyniləşdirmək olmaz, lakin əlində tam material olmadığından qəti fikir söyləməyə çətinlik çəkdiyi üçün təəssüflənir.

Sonrakı tədqiqatlarında Xrjanovski (1954, 1958) *R. myriacanthanı* Qafqaz florasından çıxardır və nədənsə bu bölgədə *R. tschatyrdagi* növünün yayıldığını göstərir.

Sonrakı illərin tədqiqatçıları da bu məsələ ilə əlaqədar növün sistematik yerini müəyyən etməyə aydınlıq gətirmir.

Belə ki, J.Klasterski (1968) R. myriacantha DC. və *R. tschatyrdagi* Chrshan. növlərini *R.pimpinellifolia* L. növünə yaxınlaşdırır və onların bir növ olduğunu qəbul edir.

A.İ.Qaluşko (1961) faktiki tədqiqat materiallarına əsaslanaraq Qafqazda *R. myriacantha* DC. növünün yayıldığını göstərir. İ.P.Mandenova (1983) Gürcüstan florasında *R. tschatyrdagi* Chrshan. növünün mövcudluğunu göstərir. H.H.Hacıyeva (1983) da Qafqazda? o cümlədən də Azərbaycanda *R. tschatyrdagi* Chrshan. növünün olduğunu qəbul edir.

## MATERİAL VƏ METODLAR

Biz keçən əsrin 70-ci illərində V.G.Xrjanovski ilə Azərbaycan florasından toplanmış herbariləri

təyin edərkən Böyük Qafqazın cənub yamaclarında (Azərbaycan ərazisində) *R.tschatyrdagi* Chrshan. növünün "Schemachensis" Chrshan. et İskend. növ müxtəlifliyinin yayıldığını müəyyən etdik (şəkil 1 və 2). Bu növ müxtəlifliyi üçün açar olaraq aşağıdakı morfoloji əlamətlər xarakterikdir:- qopartikanları yaşlı və çiçəkləyən cavan budaqlarda sıx və müxtəliftiplidir, çiçək yatağı və saplağı sıx vəzili-cod tüklüdür, yarpaq oxu həmişə vəzili-cod tüklüdür, ləçəkləri ağdır.

Xrjanovski hələ o illərdə bu növü Qafqaz materialları əsasında ətraflı yoxlamağı tövsiyə etmişdir.

V.Q.Xrjanovskinin (1953) *Rosa tschatyrdagi* növünə verdiyi təsvirdə *Rosa myriacanthadan* aşağıdakı əlamətlərinə görə fərglənir:

***Rosa tschatyrdagi* Chrshan.**

Qopartikanları birtiplidir, az və ya çox dərəcədə seyrəkdir, iynəvaridir, daim üfiqidir, 6-8mm uzunluqdadır, bəzən cod tükvari tikancıq qarışıqlıdır. Yarpağı 5-6 sm uzunluqda, yarpaqcıqları 12 mm uzunluqda, 7 mm enindədir. Çiçək saplağı çılpaqdır və ya seyrək vəziciklərlə örtülmüşdür, adətən 20-25 mm uzunluqdadır. Gülü (ləçəkləri) krem (açıq sarı) rəngindədir, 35-40 mm diametrindədir.



**Şəkil 1.** *R.tschatyrdagi* Chrshan. Böyük Qafqazın cənub yamacları (Azərbaycan ərazisində), Şamaxı r-nu Məlhəm k. yaxınlığında, alçaq və seyrək kolluğlu yamaclarda və çəmənlikdə kökümsovlarından çoxalaraq alçaq cəngəllik yaradırlar, 20.VII.1970, 23.VII.1973, İsgəndərov.



**Şəkil 2.** *Rosa myriacantha* DC. Şamaxı rayon mərkəzi ətrafında, Zavalan çayın sağ sahili, kolluq ərazidə, 19.V.1973, İsgəndərov, Piskunov.

***Rosa myriacantha* DC.**

Qopartikanları müxtəliftiplidir, çox sıxdır, iridir, iynəvarıdır, 10-12 mm uzunluqdadır, bolluca tükvari tikancıq qatışıqlıdır, çiçəkli budaqlarda yuxarıya meyillidir. Yarpağı 2,5-3,5 sm uzunluqdadır, yarpaqçıgları xırdadır, adətən 7 mm uzunluqda, 5mm enindədir. Çiçək saplağı açıq-aydın vəzili-cod tüklüdür, 12-15 mm uzunluğu ötüb keçmir. Gülü (ləçəkləri) ağdır, 25-30 mm diametrindədir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Keçən əsrin 70-ci illərindən başlayaraq biz Azərbaycan Respublikası Elmlər Akademiyası Botanika İnstitutun Botanika Bağında (indiki Azərbaycan Milli Elmlər Akademiyasının Mərkəzi Nəbatat Bağı) Qafqaz florası ekspozisiyalarının yaradılması məqsədi ilə Böyük və Kiçik Qafqazın müxtəlif bölgələrindən ağac, kol bitkiləri, o cümlədən tərəfimizdən *Rosa* L. cinsinin itburnu növlərindən ibarət əkin və səpin materialları gətirilmiş, küllü miqdarda onların herbariləri toplanmışdır. Hazırda Mərkəzi Nəbatat Bağında digər qafqaz növləri ilə yanaşı *Pimpinellifoliae* DC.

seksiyasına mənsub olan *R.spinosissima* L., *R.elasmacantha* Trantu. və *R.tschartydagi* Chrshan. (adı hələlik şərtidir) növlərinin toxumundan, kökümsovlarından yetişdirilmiş müxtəlif yaşlı nümunələri, eləcə də onların populyasiya və reproduksiya formaları vardır.

**Qeyd:** *Mən 1987-ci ildə SSRİ EA-nın Botanika İnstitutunda (İndiki Rusiya EA-nın Sankt-Peterburq Botanika İnstitutu) ezamiyyətdə olarkən çox zəngin olan Qafqaz florası herbari fondunda bu qəbildən olan materiallara bir daha baxdım və qeydlər etdim.*

*Herbari şöbəsinin elmi əməkdaşı hörmətli Buzunova İrina Oleqovna Rosa myriacantha DC. növünün herbarisinin orijinaldan surətinin şəklini Fransadan əldə edib bizə göndərəcəyini bildirdi və göndərdi (şəkil 3.)*

***Bir daha İrina Oleqovnaya minnətdarlığımı bildirirəm (İsgəndərov A.T.).***



**Şəkil 3.** *Rosa myriacantha* DC. Fransanın canubunda Monpele şəhəri ətrafından təsvir olunmuş herbarisinin orijinaldan çıxarılmış surəti.

Toplanmış çoxlu faktiki materialları, təbiətdə və kulturada bitkilər üzərində aparılan müşahidələr, Rusiya EA-nın Botanika Institutunda saxlanılan bu qəbildən olan herbariləri müqayisə edərkən, ən nəhayət adı gedən taksonun orijinaldan əldə etdiyimiz herbarinin fotoşəkli ilə müqayisəsi bu növün taksonomiyasına tənqidi yanaşmaqla Qafqazda *Rosa myriacantha* DC. yoxsa *Rosa tschatyrdagi* Chrshan. yayılmasına dair bizim baxışımızda şübhəyə son qoydu və Qafqaz nümunələrinin morfoloji əlamətlərinnin *Rosa myriacantha* DC. təsvirinə daha çox uyğun gəldiyini göstərdi: qopartikanları sıx və müxtəliftiplidir, çiçək yatağı və saplağı sıx vəzili-cod tüklüdür, yarpaq oxu həmişə vəzili-cod tüklüdür, gülü (ləçəkləri) ağdır.

Digər açar əlamətlərdə *R. myriacantha* və *R. tschatyrdagi* arasında əsaslı elə bir fərq yoxdur. Elə fərqli əlamətlər də vardır ki, məsələn yarpağın və yarpaqcıgların ölçüsü, gülünün diametri və s. həll edici əhəmiyyətə malik deyildir, belə ki, digər qruplarda olduğu kimi bitdiyi şəraitlə əlagədar ölçüsü dəyişilə bilər.

Beləliklə Qafqaz florasından o cümlədən də Azərbaycanın müxtəlif bölgələrindən əvvəllər və son illərdə toplanmış faktiki materiallara, bizim təbiətdə və kulturada tədqiqat və müşahidələrimizə əsaslanaraq birmənalı deyə bilərik ki, *Pimpinellifoliae* DC. seleksiyasında sərbəst növ kimi təmsil olunmaqla Qafqaz o cümlədən Azərbaycan florasında məhz *R. myriacantha* DC. yayılmışdır.

## ƏDƏBİYYAT


**Гаджиева Г.Г.** (1983) Шиповники из подрода *Chamaerhodon* Dumort. Во флоре Кавказа. Новости сист. Высш. Раст.,.**20:** 121-126

**Галушко А.И.** (1961) Материалы к изучению шиповников Северного Кавказа. Бот.мат.герб. Бот. Ин-та АН СССР, **21:** 206-232.

**Гроссгейм А.А.** (1934) Флора Кавказа, **IV:** 107-126.

**Искендеров А.Т.** (1999) О произрастании на Кавказе *Rosa myriakantha* DC. Azərbaycan florası, Bitkiliyinin istifadəsi və qorunması. Bakı: 122-126.

**Лоначевский А.А.** (1910) Таблица для определения шиповников Европейской части России. Рус.бот.журн., **3:** 21-31.

**Лоначевский А.А.** (1913) Шиповники Батумской области. Изв. Тифлисск. Бот.сада, **30:** 1-14.

**Манденова Н.П.** (1964) Определитель растений Грузии. **1:** 134-138.

**Сосновский Д.И.** (1943) Таблица для определения Кавказских шиповников Изв. Азерб. фил. АН СССР, **3:** 58-67.

**Хржановский В.Г.** (1953) Критическая заметка о *R. мyriacantha* DC. Бот. Мат. герб. Бот. ин-та АН СССР, **15:** 58-67.

**Хржановский В.Г.** (1954) Род *Rosa* L. в кн. Флора Азербайджана, **V:** 144-176.

**Хржановский В.Г.** (1958) Розы. М., 497 с.
**Юзепчук С.В.** (1941) Род *Rosa* L. В кн. Флора СССР, **X:** 431-506.
**Bieberstein F.A.M.** (1808) Flora taurico-cancasica, **3:** 819.
**Boissier E.** (1872) Flora orientalis, **II:** 668-689.
**Boulanger G.A.** (1935) in Bull. Jard. botan. de Bruxelles, **XIII.**
**Crepin F.** (1880) in Bull. Soc. bot. d. Belg., **XIX.**
**Crepin F.** (1882) in Bull.Soc.bot. d. Belg., **XIX.**
**Klastersky J.** (1968) *Rosa* L. In Flora Europaea, **II:** 25-32.
**Lamark J.B.** et **A.P.De Candolle** (1805) Flora trancaise, Ed.3, **IV.**

**Искендеров А.Т., Гафарова О.О.**

**Заметки о Произрастании Вида *Rosa myriacantha* DC. на Кавказе**

Распространение вида *Rosa myriacantha* DC. в Кавказской флоре, описанного (De Candolle, 1805) во Флоре Франции, воспринималось исследователями не однозначно. На основании фактических материалов, собранных на Кавказе, в частности, в различных регионах Азербайджана, а также основываясь на наши исследования и наблюдения в природе и культуре, установлено, что на Кавказе, в том числе в Азербайджане, представленный как самостоятельный вид в секции *Pimpinelilifoliae* DC. распространен не *Rosa tschatyrdagi* Chrshan., а именно *Rosa myriacantha* DC.

**Iskenderov A.T., Gafarova O.O.**

**Notes on the Vegetation Species *Rosa myriacantha* DC. in Caucasus**

*Rosa myriacantha* specie which was described in France flora spreading out in Caucasus flora was greeted ambiguously by scientists. Based on plant samples which were collected from different regions, as well as on our investigations and observations in nature, and in culture it was found out that it was presented as a free species in *Pimpinellifoliae* DC. It was also found out that it is *Rosa myriacantha* DC but not *Rosa tschatyrdagi* Chrshan presented as independent species in *Pimpinellifoliae* DC section.

# İonlaşdırıcı Şüalanmanın Xroniki Təsiri Şəraitində Dəvətikanı (*Alhagi pseudalhagi*) Bitkisinin Yarpaq və Çiçəklərində Vegetasiyanın Müxtəlif Mərhələlərində Antosian, Karotinoid və Flavonoid Piqmentlərinin Toplanması

**G.Ə.Abdullayeva[1], E.S.Cəfərov[*1], H.Q.Babayev[2], C.R.Orucova[1]**
[1]*AMEA Radiasiya Problemləri İnstitutu, F.Ağayev 9, Bakı AZ 1143, Azərbaycan,*
*E-mail: e_dzhafarov@rambler.ru*
[2] *AMEA Botanika İnstitutu, Badamdar şossesi 40, Bakı AZ 1073, Azərbaycan*

**İşdə kiçik dozalı radioaktiv şüalanmanın müxtəlıf vegetasiya mərhələlərində dəvətikanı bitkisinin iki orqanında (yarpaq və çıçəklərdə) antosian, karotinoid və flavonoid kimi bioloji aktiv maddələrin sintezinə təsiri öyrənilmişdır. Müəyyən edilmişdir ki, bu maddələrin sintezi, həm radiasiya, həm də ətraf mühitin iqlim, yüksək temperatur və işıq amillərinə qarşı həssasdır.**
***Açar sözlər:*** *radioaktiv şüalanma, dəvətikanı bitkisi, antosian, karotinoid, flavonoid*, *vegetasiya mərhələləri*

## GİRİŞ

Bitkilərin müxtəlif abiotik amillərin təsirinə cavab reaksiyası onlarda struktur və fizioloji-biokimyəvi dəyişikliklər üçün zəmin yaradır. Abiotik amillərin təsiri bitkilərdə bir sıra adaptiv-uyğunlaşma əlamətləri formalaşdırır və bitkilər həmin təsirə özünəməxsus şəkildə müqavimət göstərir. Ekstremal amillərin fizioloji-biokimyəvi proseslərə təsir göstərməklə bioloji aktiv maddələrin sintezini inhibirləşdirə bilməsi də, bu baximdan, yolveriləndir (Пьянков и Кондрачук, 2003). Antosianlar, karotinoidlər, flavonoidlər həm ontogenez prosesində, həm də müxtəlif ətraf mühit amillərinin təsiri ilə dəyişə bilən bioloji aktiv maddələr hesab olunurlar (Сорокопудов и др., 2005). Bu baxımdan, radiasiya amilinin də bioloji aktiv maddələrin sintezində rolunun öyrənilməsi elmi və praktiki əhəmiyyətə malikdir.

Bitkilərin radioaktiv şüalanmaya cavab reaksiyası şüalanmanın intensivliyi ilə yanaşı, çoxlu sayda digər amillərdən də, o cümlədən, xromosomların sayından, onların ölçüsündən, mitotik tsiklin mərhələ və davamlılıq müddətindən, toxuma və hüceyrələrin növündən, bitkilərin qidalanma şəraitindən və s. asılı olur (Растение и стресс, 2008).

Kiçik dozalı radiasiyanın bitkilərin həm əsas molekullarının, həm də xlorofil, karotinoid, antosian və flavonoidlərin sintezində əhəmiyyətli rola malik ola bilməsinə dair məlumatlar da son illərin daha çox müzakirə olunan və daha çox mübahisə doğuran mövzusuna çevrilmişdir (Ипатова, 2005).

Dəvətikanı bitkisinin müxtəlif bioloji aktiv maddələrlə, o cümlədən, antosian, karotinoid və flavonoidlərlə zəngin olmasına dair məlumatlar mövcuddur (Флора Азербайджана, 1954). Həmçinin, məlumdur ki, dəvətikanı bitkisinin yerüstü hissəsindən götürülmüş nümunələr bakterisid təsirə malikdir (Ghosal and Srivastava, 2006).

Təqdim olunan işdə dəvətikanı bitkisinin inkişafının müxtəlif mərhələlərində antosian, karotinoid və flavonoidlər kimi bioloji aktiv maddələrin sintezinə kiçik dozalı ionlaşdırıcı şüalanmanın xroniki təsirinin bəzi xüsiyyətləri öyrənilmişdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat obyekti kimi Romanı yod zavodunun istehsalat ərazisindən götürülmüş dəvətikanı (*Alhagi зseudalhagi* (Bieb.)) bitkisindən istifadə edilmişdir. Bitkinin təcrübə nümunəsi 350 mkR/saat, kontrol nümunəsi isə 10 mkR/saat ekspozisiya dozası gücü ilə xarakterizə olunan yerlərdən götürülmüşdür.

Bitki nümunələrində antosianların ümumi miqdarı Sims və Camon (Sims and Gamon, 2002) tərəfindən təklif edilən spektrofotometrik üsulla 537; 647; 663 nm dalğa uzunluqlarında optik sıxlığın təyini əsasında hesablanmışdır.

Flavonoidlərin ümumi miqdarını müəyyən etmək üçün S.S.Lombayeva və b. (Ломбаева и др., 2008) tərəfindən işlənilib hazırlanmış diferensial spektrofotometriya üsulundan istifadə edilmişdir. Nümunələrin optik sıxlığı 414 nm dalğa uzunluğu oblastında müəyyənləşdirilmişdir. Flavonoidlərin faizlə ümumi miqdarı putinə və mütləq quru kütləyə əsasən hesablanmışdır.

Karotinoidlərin ümumi miqdarının təyini üçün Sims və Gamon (Sims and Gamon, 2002) tərəfindən təklif edilmiş düsturdan istifadə edilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Antosianların sərbəst radikalları zərərsizləşdirə bilən quruluşa malik, effektiv fenol antioksidantlar olması məlumdur (Чуб, 2008). Müəyyən edilmişdir

ki, bitkilərin yarpaq və gövdələrində əmələ gələn bu piqmentlər nisbətən kiçik temperatur şəraitində (ilkin yaz və payız vegetasiyasında) süzgəc kimi fəaliyyət göstərməklə, günəş şüaları üçün özünəməxsus "tələ" rolunu oynayır. Daha dəqiq desək, bu dövrdə antosianlar işıq enerjisini istilik enerjisinə çevirməklə bitkiləri soyuqdan qorumaq funksiyasını yerinə yetirir (Чуб, 2008).Yarpaqlarda antosianların miqdarının dəyişmə səbəblərindən biri bitkinin aşağı temperatur şəraitində böyüməsi və yüksək UB-şüalanma fonudur (Чуб, 2008).

Qeyd edək ki, bir çox ətraf mühit amillərinin antosianların bitkilərdə toplanma prosesinə təsirinə dair məlumatların olmasına baxmayaraq, ionlaşdırıcı şüalanmanın bu prosesdə roluna dair hələ də müəyyən bir fikir formalaşmamışdır.

Romanı yod zavodunun istehsalat ərazisini çirkləndirən $^{40}K$, $^{238}U$, $^{226}Ra$ , $^{232}Th$ kimi təbii radionuklidlərin yaratdığı ionlaşdırıcı şüalanmanın ərazidə yabanı formada yetişən dəvətikanı bitkisinin inkişafının müxtəlif mərhələlərində antosian sintezinə təsirinə dair aldığımız nəticələr 1 saylı şəkildə (A və B) öz əksini tapmışdır.

A




B




**Şəkil 1.** Dəvətikanının yarpaqlarında (A) və çiçəklərində (B) antosianların ümumi miqdarı.

Bu piqmentlərin miqdarı bitkinin inkişafının müxtəlif mərhələlərində fərqlənir. İyul ayında antosianların miqdarı maksimum həddə çatır. Sonrakı dövrdə antosianların miqdarı kəskin azalır və vegetasiya dövrünün sonuna qədər, kontrolda cüzi artmanı çıxmaq şərti ilə, dəyişməz qalır.

Maraqlıdır ki, antosianların miqdarının bu cür dəyişmə meyli həm yarpaqlarda, həm də çiçəklərdə müşahidə olunur. Ancaq antosianların miqdarı çiçəklərə nisbətən dəvətikanı bitkisinin yarpaqlarında daha yüksədir.

Qeyd edək ki, ayrı-ayrı bitki orqanlarında antosianların miqdarının vegetasiya dövründən asılılığına dair məlumatlar bəzi hallarda bir-biri ilə ziddiyyət təşkil edir. Bunun səbəbi, ilk növbədə, antosianların bioloji rolunun hələ də tam aydınlaşdırılmamasıdır.

Harborn və Simmonds (Харборн и Симмондс, 1968) hesab edirlər ki, yarpaqların payız rəngini (qırmızı rəng də daxil olmaqla) yaşıl piqmentlərin (xlorofillərin) parçalanması müəyyənləşdirir. Onların fikrincə, payız vegetasiyasına qədər karotinoidlərin, ksantofillərin və antosianların uyğun olaraq yaratdıqları sarı, narıncı və qırmızı rənglər xlorofillərin yaratdığı yaşıl rəng fonunda, sadəcə olaraq, görünmürlər.

Запрометова (1974) görə yuxarıda deyilən fikir karotinoid və ksantofillər üçün qəbul olunandırsa, antosianlar üçün bu fikir yolverilməzdir. Onun fikrincə, antosianlar yarpaqlarda xlorofillərin miqdarı azalmağa başlayana qədər, demək olar ki, olmurlar. Bitkilər yalnız o zaman antosianlar sintez etməyə başlayırlar ki, xlorofillərin parçalanma prosesinə artıq start verilmiş olsun. Bunun əsasında isə antosianların bitkini işığın təsirindən mühafizə etməsi dayanır.

Payızda antosianların aktiv əmələgəlməsini məqbul hesab edənlər də vardır (Дейнека и др., 2003). Buna səbəb olaraq, yenə də temperaturun azalması və nəticədə yarpaqlarda qida maddələrinin (əsasən də, şəkərin) sintezinin ləngiməsi göstərilir.

Radioaktiv şüalanmanın bu prosesdə roluna gəldikdə isə, onu deyə bilərik ki, aktiv vegetasiyanın yaz və yay dövrlərində ionlaşdırıcı şüalanma antosianların sintezinin cüzi ləngiməsinə, payız dövründə isə cüzi sürətlənməsinə səbəb olur.

Dəvətikanının iki müxtəlif orqanında (yarpaq və çiçəklərində) antosianların miqdarında müşahidə olunan maksimumun həm bitkinin kontrol, həm də ionlaşdırıcı şüalanmanın təsiri şəraitində formalaşan təcrübə nümunəsində müşahidə olunması radiasiya amilinin bu prosesdə əhəmiyyətli rola malik olmamasından xəbər verir. Hesab edirik ki, iyul ayında müşahidə olunan intensiv antosian sintezi, böyük ehtimalla, həmin ay üçün xarakterik yüksək işıqlılıq və istilik amilləri

ilə bağlıdır. Ədəbiyyat materiallarının təhlilindən də aydın olur ki, aşağı temperatur və intensiv işıqlanma antosianların əmələgəlmə prosesini stimullaşdıra bilir (Дейнека и др., 2003).

Sentyabr ayı üçün kontrol bitkində müşahidə olunan maksimum qiyməti, radiasiya effekti kimi qəbul etmək olar. Fərz etmək olar ki, ətraf mühitin işıq və istilik dərəcəsinin az olduğu payız vegetasiyasında ionlaşdırıcı şüalanma stimullaşdırıcı rol oynamaqla, antosian sintezini sürətləndirə bilir. Başqa sözlə desək, bu dövrdə bitki antosian sintezi üçün radioaktiv şüalanma enerjisindən istifadə edir.

Flavonoid əmələgəlməsinə və toplanmasına bitkinin yetişmə şəraitinin təsir etməsi kifayət qədər tutarlı dəlillərlə sübut olunmuşdur (Харборн, 1968, 1985). Bir qrup tədqiqatçılar bu proseslərdə işığın müstəsna rol oynadığını söyləyirlər. Hesab olunur ki, işıq flavonoid biosintezində stimullaşdırıcı rol oynayır (Grisebach, 1967).

Dəvətikanı bitkisinin yarpaq və çiçəklərində bu bitkinin inkişafının ayrı-ayrı fazalarında flavonoidlərin toplanma və radiasiyanın təsiri ilə dəyişmə xüsusiyyətlərinə dair aldığımız nəticələr 2 saylı şəkildə (A və B) göstərilmişdir.

**A**




**B**




**Şəkil 2.** Dəvətikanının yarpaqlarında (A) və çiçəklərində (B) flavonoidlərin ümumi miqdarı.

Aktiv vegetasiyanın bütün mərhələlərində flavonoidlərin miqdarında aşkar fərqlər mövcuddur. Daha dəqiq desək, kontrol bitkinin yerüstü hissəsində flavonoidlərin miqdarı qönçələmə mərhələsində daha yüksək olur, sonradan bu miqdar azalmağa başlayır və payız vegetasiyasında minimal həddə çatır.

Qeyd edək ki, vegetasiya dövrü ərzində flavonoidlərin toplanma dinamikasına dair müxtəlif illərdə ayrı-ayrı müəlliflər tərəfindən alınmış təcrübi nəticələr bir-birindən kəskin fərqlənir. Ola bilsin ki, bu fərqə səbəb bitkinin növü, vegetasiya mərhələsinin müxtəlifliyi və ətraf mühit amilllərıdir. Belə ki, maksimal flavonoid toplanması bir halda qönçələmə və ya çiçəklənmənin başlanğıcına düşdüyü halda, digər halda çiçəkləmə və ya meyvəvermə fazasına düşə bilər.

Radiasiyanın xroniki təsiri şəraitində bitən bitki nümunəsində isə fərqli mənzərənin şahidi oluruq. Bu halda radiasiyanın xroniki təsirinə məruz qalmış dəvətikanı bitkisinin fenofazalar üzrə flavonoid toplama qabiliyyəti meyvə əmələgətirmə fazasında daha intensiv olur. Bu faza iyul ayının birinci yarısına təsadüf edir ki, bunun da səbəbi, çox yəqin ki, Günəşin intensivliyinin yüksək olduğu həmin period ərzində ionlaşdırıcı şüalanmanın stimullaşdırıcı rol oynaması, yəni bitkidə bioloji aktiv maddə toplanması prosesini sürətləndirməsi ilə əlaqədardır.

Bitkilərin fizioloji xüsusiyyətlərindən biri flavonoidlərin müxtəlif orqan və toxumalarda qeyri-bərabər paylanması və hansısa bir orqanda daha çox toplana bilməsidir (Ломбаева и др., 2008). Tədqiq olunan bitkinin ayrı-ayrı orqanlarında (yarpaq və çiçəklərində) flavonoidlərin toplanmasına dair aldığımız nəticələrdən aydın olur ki, bu piqmentlərə bitkinin hər iki orqanında rast gəlmək olur. Flavonoidlərin ümumi miqdarı bitkinin yarpaqlarında çiçəkləri ilə müqayisədə yüksək olur. Maraqlıdır ki, radiasiyanın xroniki təsiri şəraitində formalaşmış bitkinin yarpaqlarında da bu vegetasiya periodunda flavonoidlərin ümumi miqdarı yüksək olur.

Ərazini çirkləndirən radionuklidlərin yaratdığı ionlaşdırıcı şüalanmanın kifayət qədər yüksək enerjiyə malik olmasını əsas götürməklə, hesab etmək olar ki, bu prosesdə radioaktiv şüalanma müəyyən rola malik olmalıdır. Alınmış nəticələr bu fikri tamamilə sübut edir. Belə ki, əgər radiasiya bitkinin inkişafının ilkin mərhələsində flavonoid sintezini ingibirləşdirirsə, sonrakı mərhələlərdə o stimullaşdırıcı rol oynayır.

İlkin tədqiqatlar zamanı müəyyən edilmişdir ki, karotinoidlər bitkinin ilkin böyüməsi zamanı əmələ gəlməyə başlayır, aktiv boyatma zamanı isə yüksək sürətlə artırlar (Beck and Redman, 1940).

A




B




**Şəkil 3.** Dəvətikanının yarpaqlarında (A) və çiçəklərində (B) karotinoidlərin ümumi miqdarı.

Maksimal boyatma dövründə karotinoidlərin konsentrasiyasının yüksək olması əsaslı dəlillərlə çoxlu sayda bitkilər üçün sübut olunmuşdur (Sprague and Curtis, 1983). Quraqlıq vaxtı karotinoidlərin miqdarının azalmasını sübut edən dəlillər də vardır (Virtanen, 1983).

Digər bir işdə göstərilir ki, yarpaqların payız sarılığına səbəb xlorofillərin parçalanması olsa da, bu dövrdə karotinoidlərin özləri də kifayət qədər parçalanmaya məruz qalır (Euler et al., 1981).

Işıqtoplayıcı və işıqdan mühafizə funksiyasını da yerinə yetirən karotinoidlərə (Гапоненко и Шамаль, 2006) bitkilərin müxtəlif ətraf mühit çirkləndiricilərinə tolerantlığını təmin edən əsas piqment kimi baxanlar da vardır (Мокроносов, 1981).

Radiasiyanın xroniki təsiri şəraitində bitən dəvətikanı bitkisinin yarpaq və çiçəklərində karotinoidlərin ümumi miqdarına dair bizim aldığımız nəticələrin təhlilindən aydın olur ki, karotinoidlərin miqdarı yaz vegetasiyasında (sürətli boyatma dövründə) kifayət qədər yüksək olur ki, bu da, artıq qeyd etdiyimiz kimi, əksər bitkilər üçün müxtəlif müəlliflərin aldığı nəticələrə tamamilə uyğun gəlir.

Yay vegetasiyasında sarı piqmentlərin miqdarı əsaslı surətdə dəyişməyə məruz qalır. Hesab etmək olar ki, karotinoidlərin bu dövrdə azalmasına səbəb Abşeron yarımadasının həmin dövr üçün xarakterik olan yüksək temperaturu və davamlı quraqlığı ola bilər. Payız vegetasiyasında karotinoidlərin miqdarında baş verən dəyişmələrə gəldikdə isə bu dəyişmələr özünəməxsusluğu ilə seçilir.

Başqa sözlə desək, bu dövrdə bitkinin həm təcrübə, həm də kontrol nümunələrində karotinoidlərin miqdarında kiçik artmalar müşahidə olunur (şəkil 3, A, B). Bu dəyişmələri, böyük ehtimalla, karotinoidlərin mühafizə rolunun artması ılə əlaqələndirmək olar. Belə kı, əksər ot bitkilərinin vegetasiya dövrünün sona çatdığı bu dövrdə ətraf mühitin ekstremal təsirləri daha aydın şəkildə özünü biruzə verir ki, bu da özünü, ilk növbədə, karotinoidlərin miqdarının artmasında göstərir.

## ƏDƏBİYYAT


**Гапоненко В.И., Шамаль Н.В.** (2006). Физиолого-биохимические особенности растений ячменя и люпина при действии ионизирующей радиации и засухи. Тезисы докладов межд. конф. «Биологические эффекты малых доз ионизирующей радиации и радиоактивное загрязнение среды». Сыктывкар: с. 152.

**Дейнека В.И., Григорьев А.М., Староверов В.М., Сиротин А.А.** (2003). Химия природных соединений. **4**: 324-325.

**Запрометов М.Н.** (1974). Основы биохимии фенольных соединений: с. 123.

**Ипатова В. И.** (2005) Адаптация водных растений к стрессовым факторам среды. М.: Изд.-во «Графикон-принт» :224 с.

**Ломбаева С.С., Танхева Л.М., Оленников Д.Н.** (2008). Методика количественного определения суммарного содержания флавоноидов в наземной части Ортилии однобокой *(Orthilia sekunda L. House)*. Химия растительного сырья. **2**: 65-68.

**Мокроносов А.Т.** (1981). Онтогенетический аспект фотосинтеза. М.: Наука. 196 с.

**Пьянков В. И., Кондрачук А. В.** (2003) Основные типы структурных перестроек мезофилла листа растений Восточного Памира при адаптации к высокогорным условиям. Физиология растений. **50** (1): 34-42.

**Сорокопудов В.Н., Хлебников В.А., Дейнека В.И.** (2005) Антоцианы некоторых растений семейства *Berberidaceae.* Химия растительного сырья. **4**: 57-60.

**Растение и стресс** (2008) Под ред. А.В.Деникиной. Екатеринбург: с.172-186.

**Флора Азербайджана** (1954) Под ред. И.И.Карягина. Баку: Изд.-во АН Азерб. ССР, т. **5**, 580 с.

**Харборн Дж.** (1985) Введение в экологическую биохимию: 312 с.

**Харборн Дж., Симмондс Н.У.** (1968) Распространение фенольных агликонов в природе. Биохимия фенольных соединений. с. 70-108.

**Чуб В.** (2008) Для чего нужны антоцианы. Цветоводство. **6**: 22-25.

**Чхубианишвили Е.И., Чанишвили Ш.Ш., Качарава Н.Ф., Бадридзе Г.Ш**. (2009) Структурно-функциональные растений в условиях высокогорий Малого Кавказа. Физиология и биохимия культурных растений. **41 (2):** 132-139.

**Beck W.A., Redman R.** (1940) Seasonal variations in the production of plant pigments. Plant Physiol., **15:** 81-94.

**Euler H., Demole V., Weinhagen A., Karrer P.** (1931) Weitere Beobachtungen über die beziehungen des wachstumsfaktors zum Carotin. Helv. Chim. Acta., **14(4):** 831-833.

**Ghosal S., Srivastava R.S.** (1973) Chemical investigation of *Alhagi pseudalhagi* Desv.: β-phenethylamine and tetrahydroisoquinoline alkoloids. Journal of Pharmaceutical Sciences. **62 (9):** 1555-1556.

**Grisebach H.** (1968) Biosynthetic patterns on microorganisms and higher plants. Journal of basic microbiology. **8 (5):** 479-480.

**Sims D.A. and Gamon J.A.** (2002) Retationships between leaf piqment content and spectral reflectance across a wide rang of species, leaf structures and devolepmental stages. Remote Sensing of Enviroment, **81**: 337-354.

**Sprague H.B., Curtis N.** (1933) Chlorophyll content as an index of the productive capacity of selfed lines of Corn and their hybrids. J. Amer. Soc. Agronom., **25:** 709-724.

**Virtanen A.I., Hausen S.V., Saastamoinen S.** Untersuchungen über die vitaminbil dung in pflanzen. (1933) J. Biochem. Zeitschr., **267:** 179-191.

**Г.А. Абдуллаева, Э.С.Джафаров, Г.Г.Бабаев, Дж.Р.Оруджева**

### Вегетационно-зависимое Накопление Антоцианов, Каротиноидов и Флавоноидов в Листьях и Цветках Верблюжьей Колючки (*Alhagi pseudalhagi* (Bieb.)) в Условиях Хронического Воздействия Ионизирующей Радиации

В работе было исследовано воздействие низкоинтенсивного радиоактивного излучения на синтез антоцианов, каротиноидов и флавоноидов в двух органах (листьях и цветках) верблюжьей колючки (*Alhagi pseudalhagi* (Bieb.)) на разных уровнях вегетационного периода. Было установлено, что синтез этих веществ зависит как от радиационного фактора, так и от климата окружающей среды, высокой освещенности и высокой температуры.

**G. A. Abdullayeva, E. S. Dzhafarov, H.G. Babayev, J.R.Orujova**

### Vegetative-depended Accumulation of Anthocyans, Carotenoids and Flavonoids in Leaves and Flowers *Alhagi pseudalhagi* Growing Under Chronic Influence Ionizing Radiation

The influence of low intensively radioactive irradiation on synthesis anthocyans, carotenoids and flavonoids in two bodies (leaves and flowers) of *Alhagi pseudalhagi* (Bieb.) in different vegetative periods has been investigated in this study. It has been found out that process of accumulation of these substances depends on radiating factor as well as environmental climate high light exposure and high heat.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 123-126 (2012)*

# Влияние Состояния Вегетативной Нервной Системы На Достижение Спортивных Результатов

**Багирова Р.М., Гусейнов Ф.Д.**
*Азербайджанская Государственная Академия Физической Культуры и Спорта, ул. Фатали Хана Хойского, 98, Баку AZ 1000, Азербайджан, E-mail: farhadland@yahoo.fr*

**Исследование электрокожного сопротивления, отражающего состояние вегетативной нервной системы, выявили эффективность применяемых методик психомышечной тренировки и биологически обратной связи, которые позволяют сократить сроки овладения релаксацией, повышают самочувствие, активность, настроение и уверенность спортсменов, снижают уровень тревожности и улучшают спортивную результативность.**
***Ключевые слова**: вегетативная нервная система, электрокожное сопротивление, уровень тревожности, спортивная результативность.*

## ВВЕДЕНИЕ

Исследование понятия «стиль» и способов его функционирования в современной психолого-педагогической литературе существует большое количество подходов (Судаков, 1981; Вяткин, 1981, 2000; Леонова, 2001; Берулава, 2006). Для изучения психофизиологического состояния, отражающего состояние вегетативной нервной системы, введено понятие индивидуального стиля саморегуляции (ИСС). В исследованиях некоторых авторов (Моросянова, 2005) было показано, что стилевые особенности приобретают черты ИСС в случае, когда индивидуально-типические саморегуляции, детерминированные личностными переменными модулируются под влиянием конкретной деятельности и информируют такую их структуру, которая способствует достижению приемлемой для субъекта успешности. При этом следует отметить немногочисленные работы, посвященные формированию ИСС как по теоретическим, так и по практическим аспектам проблемы.

## МАТЕРИАЛЫ И МЕТОДЫ

Исследования проводились на 25 баскетболистах высшей квалификации (мастера спорта-МС, кандидаты в мастера спорта - КМС) в возрасте 20-23 года членов сборных команд Азербайджана. Для исследования состояния вегетативной нервной системы измерялись показатели фолль-диагностики, частоты дыханий и сердцебиений и температурные показатели кожи стопы и кисти. Применение данных методик осуществлялось в совокупности с биологически обратной связью (БОС). При этапном применении комплекса психомышенной тренировки (ПМТ) вырабатывали навыки мышечной релаксации с помощью фолль-диагностики, обеспечивающей БОС по электрокожному сопротивлению. Поверхностное сопротивление кожи указательного и среднего пальца руки регистрировали датчики. Упражнения ПМТ считались освоенными, когда ощущения тепла в мышцах пяти основных групп (рук, ног, туловища, шеи и лица) проявлялось легко, а температура кожи пальцев кисти и стопы повышалась на 2,5° и более по сравнению с фоновыми. Если этого удалось достичь к 5-6 занятию, мы полагали, что метод освоен успешно.

Комплексные тренировки с применением БОС проводили в одно и тоже время три раза в неделю по 25 минут. Весь курс ПМТ включал 10 занятий. Спортсмены находились в позе сидя на стуле. Самостоятельные занятия (аутотреннинг) проводились не менее 2 раз в день. С помощью манометра модели УА-702 (digital blood pressure monitor) давались самоотчеты, регистрировались частота сердечных сокращений (ЧСС) и артериальное давление (АД), температурные указатели точек на пальцах кистей и стоп (электротермометр), электрокожное сопротивление сорока точек на пальцах кистей и стоп (Гринберг, 2004).

## РЕЗУЛЬТАТЫ И ОБСУЖДЕНИЯ

Саморегуляторные, интеллектуальные, мотивационные, эмоциональные и другие личностные качества являются решающим фактором в подготовке баскетболистов к профессиональной деятельности. От индивидуальных особенностей кардиореспираторной и симпатоадреналовой систем на фоне эмоциональности в большей мере зависит спортивная работоспособность.

На рисунке 1 показаны этапные изменения электрокожного сопротивления (ЭКС) под воз-




***Рис. 1****. Изменение электрокожного сопротивления с применением биологически обратной связи психомышечной тренировки.* 1, 2, 3, 4 - этапы




***Рис. 2****. Изменение показателей частоты сердцебиений и миотонометрии баскетболистов (n=25).* 1, 2, 3, 4 - этапы.

действием ПМТ у баскетболистов. Как видно из представленного рисунка на первом этапе (январь, февраль) наблюдалось некоторое повышение функциональной активности (норма 40-60 у.е.). Уже в марте первого этапа на физиологическом уровне были показатели ЭКС. Снижение показателей ЭКС отмечалось от этапа к этапу по месяцам применения ПМТ (P<0,01- 0,001). В последующих третьем и четвертом этапах все показатели были в норме. Все это свидетельствует об эффективности применения ПМТ.

Психологическое тестирование проводилось нами для оценки личностной и реактивной тревожности и шкалы самооценок (Спилбергер, 1983). Навык произвольной релаксации формируется у спортсменов обычно к 5-6 занятию. Используя БОС, все обучающиеся баскетболисты к 7-8 занятию научились самостоятельно управлять мышечным тонусом.

Измерениями миотонометрии, ЧСС, произведенные с целью проверки качества саморегуляции по этапам обследования, подтвердилась возможность управления физиологическими функциями в необходимых пределах (рис. 3). Как видно из рисунка 2, эффективность саморегуляции при применении ПМТ путем контроля ЧСС и миотонометрии была позитивной. После завершения цикла систематических тренировок устойчивый навык формировался условно-рефлекторным путем релаксационных воздействий у баскетболистов.




***Рис. 3**. Изменение тревожности и САН по этапам применения ПМТ в соревновательном периоде (n=25.)* 1, 2, 3, 4 - этапы

Для сравнения данных тревожности было проведено и исследование самочувствия, активности, настроения (САН) по этапам применения ПМТ (рис. 3). На основании данных рисунка 3, наглядно видно, что баскетболисты в течение соревновательного периода находились в пределах умеренной и средней тревожности, которая достоверно снижалась по месяцам соревновательного периода в процессе овладения ПМТ. Разные уровни тревожности характеризуются различной интеграцией симпатических и парасимпатических механизмов регуляции сердечного режима. Высокому уровню тревожности соответствует усиленная централизация управления сердечным ритмом, что физиологически не оправдано (Данилова, 1995).

Результаты проведенного исследования выявили преимущественно низкий уровень тревожности у баскетболистов. Относительным балансом симпатико-парасимпатического взаимодействия отмечался средний уровень тревожности. Постепенные позитивные изменения личностной тревожности вызывают по этапное усиление ПМТ, САН, снижая напряженность сердечного ритма и уравновешивая активность симпатических и парасимпатических модулирующих воздействий. В этом и проявляется регулирующий эффект долговременного влияния ПМТ.

Улучшению психоэмоционального статуса и усилению резервных возможностей регуляции вегетативной нервной системы (ЭКС, ЧСС, АД, ЧД, температура, данные миотонометрии) способствует комплексное воздействие на функциональное состояние организма, проведение релаксации в совокупности с другими методами, поскольку значения САН позитивно изменялись как по вертикали (этапы ПМТ), так по горизонтали в процессе соревновательного периода.

Используя тест «умеете ли Вы справиться со стрессом», средний балл по этапам соответственно варьировал: 5,2±0,9 усл.ед; 4,9±0,33; 4,2±0,62; 3,8±0,48. Отмечалась тенденция к улучшению способности справляться со стрессом в процессе соревновательного периода. По градациям теста: 79, 8% справляются со стрессовыми ситуациями, 15,6% обнаружили способность справляться со стрессом на среднем уровне и лишь (один спортсмен) 4,6% считал, что плохо справляется со стрессом.

Процесс овладения ПМТ баскетболистами шел наиболее быстро (5-6 занятий) у более квалифицированных спортсменов (МС), по сравнению с кандидатами мастера спорта (6-7 занятий).

Результаты проведенных исследований выявили эффективность применяемой методики ПМТ и БОС, которые позволяют сократить сроки овладения релаксацией, повышают САН и уверенность спортсменов, снижают уровень тревожности и, в конечном итоге, улучшают спортивную результативность.

## ЛИТЕРАТУРА

**Берулава Г.А.** (2006) Стили индивидуальности. М.: МАГО, 44 с.

**Вяткин Б.А., Щукин М.Р.** (1995) Особенности развития учения В.С. Мерлина об интегральной индивидуальности человека. Вестн. Перм. Гос. Пед. Ун-та., сер. психология, **№1:** 3-15.

**Вяткин Б.А.** (2000) Лекции по психологии интегральной индивидуальности человека.

Пермь: Перм. Гос. Пед. Ун-т, 179 с.

**Вяткин Б.А.** (1981) Управление психическим стрессом в спортивных соревнованиях. М.: Физкультура и спорт, 112 с.

**Гринберг Дж.С.** (2004) Управление стрессом. СПб.: Питер, 496 с.

Данилова Н.Н. (1995) Сердечный ритм и информационная нагрузка. Вестник Московского Университета, **№4:** 14-27.

**Леонова А.Б.** (2001) Основные подходы к изучению профессионального стресса. Вестник психосоциальной и коррекционно-реабилитационной работы, **№11:** 2-16.

**Моросянова В.Н.** (2005) Индивидуальный стиль саморегуляции в производственной активности человека. Психологический журнал, **№4:** 26-36.

**Спилбергер Ч.Д.** (1983) Концептуальные и методологические проблемы исследования тревоги // Стресс и тревога в спорте. - М.: Физкультура и спорт, 1983, 12 - 24 с.

**Судаков К.В.** (1981) Системные механизмы эмоционального стресса. М.: Медицина, 232 с.

**R.M. Bağırova, F.C. Hüseynov**

## İdmanda Nailiyyətin Əldə Edilməsində Veqetativ Sinir Sistemin Durumunun Rolu

Veqetativ sinir sistemin durumunu əks etdirən psixofizioloji əlamətlərin öyrənilməsi məqsədi ilə fol-müayinənin, nəfəs, urək tezliyinin, əl və ayaq dərisinin temperatur göstəriciləri ölçülmüşdür. Məlum metodikaların istifadəsi bioloji əks əlaqə ilə birgə həyata keçirilmişdir. Psixoəzələ məşq kompleksinin mərhələli istifadəsi zamanı dərinin elektrik müqaviməti üzrə bioloji əks müqavimətini təmin edən, fol-müayinənin köməyi ilə əzələnin istirahəti bir vərdiş kimi inkişaf etdirilmişdir. Aparılan tədqiqatların nəticəsində istirahətin əldə edilməsi zamanının qisalmasına imkan verən, idmançıların özünə inamı və hal-əhval fəallığını (HƏF) yüksəldən, stress səviyyəsini endirən və nəticədə idman nailiyyətlərinin yüksəldməsinə imkan verən psixoəzələ məşq və bioloji əks əlaqə metodikalarının effektivliyi aşkar edilmişdir.

**R.M. Bagırova, F.C. Huseynov**

## Influence of the State Vegetative Nervous Sistem on Sports Results Achievement

Study electrodermal resistance, reflecting the state of the autonomic nervous system, showed the effectiveness of the techniques psihomyshechnoy training and biofeedback, which can reduce time mastering relaxation, improve samochuvstvin, activity, mood and confidence of athletes, reduce anxiety and improve athletic performance.

***Keywords**: autonomic nervous system, electrodermal resistance, anxiety, sports performance.*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 67, №2, səh. 127-131 (2012)*

# Buğdanın Pulsasiya Texnologiyası ilə Suvarılmasının Suvarmanın Keyfiyyətinə Və Məhsuldarlığa Təsiri

**A.M. Quliyev**
*Azərbaycan Hidrotexnika və Meliorasiya Elm Istehsalat Birliyi*

**Məqalə dörd illik (2008-2011-ci illər) tədqiqat işlərinin nəticələri əsasında tərtib olunmuş, pulsasiya suvarma texnologiyasının suvarmanın keyfiyyətinin yüksəlməsinə və məhsuldarlığa təsirinə həsr olunub. Tədqiqatlar nəticəsində pulsasiya şırnaqlı (sərfli) zolaqlarla suvarma texnologiyasının sabit şırnaqlı (sərfli) zolaqlarla suvarma texnologiyasına nisbətən yüksək üstünlüyə malik olması müəyyən edilmişdir. Belə ki, torpağın aktiv qatının tarla boyunca bərabər nəmlənmə əmsalı sabit şırnaqlı zolaqlarla suvarma zamanı 0,48 olduğu halda, pulsasiya şırnaqlı zolaqlarla suvarmada 0,95 olmuşdur, bu da pulsasiya şırnaqlı suvarma texnologiyasının yüksək keyfiyyətə malik olmasını göstərir. Suvarmanın keyfiyyətinin yüksəlməsi nəticəsində nəzarət variantı olan sabit şırnaqlı zolaqlarla suvarma texnologiyası ilə suvarılan sahədən alınan məhsula nisbətən pulsasiya texnologiyası ilə suvarılan sahənin hər hektarından 3-5 sentner əlavə məhsul alınmışdır.**

## GIRIŞ

Səth üsulu ilə suvarma apardıqda (şırımlar və zolaqlarla) tarla boyunca torpağın hesabat qatı bərabər nəmlənir. Bunun əsas səbəbi ondan ibarətdir ki, tarlanın baş hissəsi (zolaqların baş hissəsi) su altında çox qaldığı üçün torpaq dərinliyə və yanlara doğru çox nəmlənir, tarlanın aşağı hissəsi başa nisbətən su altında az qaldığı üçün normadan az nəmlənir (Bəşirov, 1999). Suvarma zamanı su itkiləri baş verir, nəticədə qrunt sularının səviyyəsi qalxır, torpaqlarda şorlaşma baş verir və torpaqların meliorativ vəziyyəti pisləşir. Nəticədə ekoloji tarazlıq pozulur.

Qeyd olunan neqativ halları aradan qaldırmaq məqsədilə «AzH və M»EIB-da N.M.Hüseynov, H.Talıbov, N.B.Bağırov və s. tədqiqatçılar tərəfindən dəyişən şırnaqlı şırımlarla aşağı hissəsində yarıqlar açılmış şırımlarla suvarma sahəsində çoxvariantlı və çoxfaktorlu tədqiqat işləri aparılaraq yaxşı nəticələr əldə edilmişdir. Lakin onların tətbiqi geniş miqyas almamışdır.

Hazırda ABŞ fermerləri tərəfindən pulsasiya texnologiyası ilə suvarmadan geniş istifadə olunur. Bu texnologiyanın tətbiqi ilə göstərilən nöqsanlar aradan qalxır, əmək məhsuldarlığı və bitkilərin məhsuldarlığı artır, suvarma işlərini tam avtomatlaşdırmada imkan yaranır (Quliyev, 2011; Сафаров, 2009). Bu texnologiyanın fərdi və fermer təsərrüfatlarında müvəffəqiyyətlə istifadəsi məqbuldur. Bunları nəzərə alaraq tərəfimizdən 2008-2011-ci il təsərrüfat illərində pulsasiya sərfli zolaqlarla suvarma texnologiyası üzərində tədqiqat işləri aparılmışdır.

## MATERIAL VƏ METODLAR

Tədqiqat işləri Göyçay rayonunun Mallı-Şıxlı kəndində fermer təsərrüfatında aparılmışdır. Tədqiqat işləri aşağıda verilmiş 3 variantda aparılmışdır.

I variant - zolaqlarla suvarma, bu variant nəzarət variantı olaraq qəbul edilmişdir;

II variant - su tarlanın sonuna çatmadan kəsilən zolaqlarla suvarma;

III variant - pulsasiya sərfli zolaqlarla suvama.

Bütün təcrübə variantlarında zolaqlarla suvama texnikasından istifadə edilmişdir. Lakin aparılan tədqiqat işləri suvarmanın aparılması texnologiyası ilə bir-birindən fərqlənir. I variantda (nəzarət) su zolağa buraxılır və tarlanın sonuna çatdıqdan sonra kəsilir. II variantda suvarma zamanı su zolağa buraxılır və onun uzunluğunun birinci suvarmada 85%-ni, sonrakı suvurmalarda isə 75%-ni qət etdikdən sonra kəsilir. Hər iki metodda su kəsildikdən sonra zolağın ümumi uzunluğunun birinci suvarmada aşağıdan quru qalan 15% hissəsi, birinci suvarmadan sonra isə 25% hissəsi zolaqlarda toplanmış su kütləsinin hesabına nəmləndirilir. Birinci suvarmada quru qalan hissənin 15% götürülməsi şum qatının kələkötürlülüyünün yüksək olması, sonrakı variantlarda torpağın birinci suvarmanın təsiri altında zolaq yatağı torpağının sıxlaşması ilə izah olunur. III variantda su zolaqlara fasilələrlə verilir.

I variantda zolaq boyunca torpaq qatının bərabər nəmlənməsini təmin etmək üçün suvarma suyu zolağın sonuna çatdıqdan sonra kəsilmədən kənara axıdılır ki, bu da su itkilərinə səbəb olur. II variantda suyun sərfi su zolağının 75-85%-ni qət etdikdən sonra kəsildiyi üçün su sərfi zolaqda azalır, bu da su itkisinin qarşısının alınmasına səbəb olur. Lakin torpaq qatı tam bərabər nəmlənmir. III variantda isə su itkilərinin qarşısı tam alınır və bərabər nəmlənmə prosesi tam təmin olunur. Təcrübə sahəsində suvarma rejimi hər üç variantda torpağın aktiv qatında faktiki nəmlik ($\beta_{Ə.A.N}$) 70%

enməsi faktoruna əsasən həyata keçirilmişdir. Torpağın aktiv qatının: dərinliyi (h) 0,70 m, ən az nəmlik tutumu ($\beta_{Ə.A.N}$) torpağın mütləq quru kütləsinin 21,6 %-ni, həcm kütləsi ($\alpha$) 1,43 t/$m^3$ təşkil etmişdir. Dövrü suvarma normaları **$m=\alpha h(\beta_{Ə.A.N}-\beta_f)$ x 100** düsturu ilə təyin edilmişdir.

## NƏTICƏLƏR VƏ ONLARIN MÜZAKIRƏSI

Təyin edilmiş suvarma rejimi əsasında həyata keçirilmiş suvarmaların nəticələri hər üç variant üzrə cədvəl 1-də verilmişdir. Buğda sahəsi 2008-2009-cu təsərrüfat ilində 4 dəfə, 2008-2010-cu təsərrüfat ilində 3 dəfə, 2010-2011-ci təsərrüfat ilində isə 2 dəfə suvarılmışdır.

Təcrübənin I variantında suvarma müddəti: I suvarmada 5 saat 25 də-qiqə ilə 9 saat 40 dəq. arasında; II suvarmada 7 saat 30 dəqiqə ilə 9 saat arasında; III suvarmada 8-9 saat arasında olmuşdur; IV suvarma isə 10 saat 20 dəqiqə davam etmişdir. Faktiki suvarma normaları I suvarmada 420-750 $m^3$/ha; II suvarmada 580-700 $m^3$/ha; III suvarmada 620-700 $m^3$/ha; IV suvarmada isə 790 $m^3$/ha təşkil etmişdir.

Ümumi suvarma norması: 2008-2009-cu təsərrüfat ilində 2820 $m^3$/ha; 2009-2010-cu təsərrüfat ilində 1740 $m^3$/ha; 2010-2011-ci təsərrüfat ilində isə 1180 $m^3$/ha təşkil etmişdir. Təcrübənin II variantında su (zolaq üçün qəbul olunmuş su sərfi q=6 l/san) zolaq uzunluğunun 85%-ni, sonrakı suvarmalarda isə 75%-ni qət etdikdən sonra kəsilmişdir. Suvarma normaları: I suvarmada 352-671 $m^3$/ha arasında, II suvarmada 511-642 $m^3$/ha arasında, III suvarmada isə 571-647 $m^3$/ha arasında dəyişilmişdir. IV suvarma 741 $m^3$ təşkil etmişdir. Ümumi suvarma normaları isə 2008-2009-cu təsərrüfat ilində 2570 $m^3$/ha, 2009- 2010-cu təsərrüfat ilində 1565 $m^3$/ha, 2010-2011-ci təsərrüfat ilində isə 1036 $m^3$/ha təşkil etmişdir.

Təcrübənin III variantında (pulsasiya sərfli suvarmada) suyun sərfi q=6 l/san olmaqla zolaqlara fasilələrlə verilmişdir. Suyun fasilələrlə verilməsi ox arxdan suvarma zolaqlarına xüsusi dəmir lövhədən hazırlanmış sipərlər vasitəsilə həyata keçirilmişdir. Suvarma zamanı su birinci dəfə sağ tərəfdə yerləşən zolağa verilmiş, 1 saat keçdikdən sonra kəsilərək solda olan zolağa ötürülmüşdür. Solda olan zolağa su 1 saat axıdıldıqdan sonra kəsilərək yenidən sağda olan zolağa ötürülmüşdür. Bu texnologiya üzrə su tarlanın sonuna çatana qədər davam etdirilmişdir. 1 saylı cədvəldən göründüyü 2008-2009-cu təsərrüfat ilində bağda sahəsi pulsasiya üsulu ilə 4 su almışdır. Dövrü suvarma normaları: 674 $m^3$/ha birinci, 512 $m^3$/ha ikinci, 647 $m^3$/ha üçüncü, 742 $m^3$/ha dördüncü suda olmuşdur.

Suvarma normaları 2009-2010-cu təsərrüfat ilində uyğun olaraq 353, 642, 572 $m^3$/ha, 2010-2011-ci təsərrüfat ilində 416, 621 $m^3$/ha təşkil etmişdir.

Ümumi suvarma normaları (vegetasiya suvarma normaları); 2008-2009-cu təsərrüfat ilində 2575 $m^3$/ha, 2009-2010-cu təsərrüfat ilində 1567 $m^3$/ha, 2010-2011-ci təsərrüfat ilində isə 1037 $m^3$/ha təşkil etmişdir (cədvəl 1).

1 saylı cədvəldən göründüyü kimi təsərrüfat illərində suvarma taktlarının (takt-suvarma ilə fasilənin cəminə bərabərdir) sayı 4-9 arasında dəyişir.

Taktların davametmə müddəti (suvarmaların davametmə müddəti) 9-10 saat arasında dəyişilir.

Təcrübənin variantları üzrə faktiki suvarma normaları bir-birilə müqayisə edilmişdir. Müqayisəli təhlil göstərir ki, aparılan təcrübələrin əsasında (2008-2011-ci təsərrüfat illərində) I varianta (nəzarət variantı) nisbətən suvarma suyuna: II variantda 144-250 $m^3$/ha, III variantda isə 143-245 $m^3$/ha qənaət edilmişdir. Uyğun olaraq bu göstəricilər faiz hesabı 8,9-12,2 və 8,7-12,12% təşkil edir (Cədvəl 2).

Fermerlər tərəfindən təsərrüfat şəraitində 2009-2010-cu təsərrüfat ilində aparılan suvarmalarda suvarma normaları ilə təcrübə sahəsində apardığımız suvarmalarda suvarma normalarının müqayisəli təhlili fərqin daha yüksək olmasını göstərir (Cədvəl 3).

Təsərrüfat şəraitində selləmə üsulu ilə aparılan suvarmalara nisbətən zolaqlarla suvarmada təcrübənin variantları üzrə: I variantda suvarma suyuna 42%; II və III variantlarda isə 47,8% qənaət olunur (cədvəl 3), təsərrüfatlarda selləmə üsulu ilə aparılan suvarmalarda verilən artıq su itkilərə səbəb olur ki, o da torpaqların meliorativ vəziyyətinin pisləşməsinə və ətraf mühitin ekoloji şəraitinin pozulmasına səbəb olur.

Təcrübə aparılmış üç variant arasında ən səmərəli suvarma pulsasiya sərfli zolaqlarla suvarmadır. Bu baxımdan pulsasiya sərfli zolaqlarla suvarmanın (III variantın) təcrübənin I və II variantlardan üstünlüyü suyun zolaqlar boyunca tarlada bərabər paylanmasında və məhsuldarlıqda daha aydın görünür.

Tərəfimizdən aparılan tədqiqatların nəticələri göstərir ki, torpağın tarla boyunca bərabər nəmlənmə əmsalı təcrübənin: I variantında (nəzarət variantında) - 0,48; II variantda - 0,43; III variantda (pulsasiya sərfli şırımlarla suvarmada) isə 0,95 olmuşdur. Təcrübələrin nəticələri pulsasiya sərfli zolaqlarla suvarmanın yüksək keyfiyyətə malik olmasını göstərir. Suvarma suyunun tarla boyunca bərabər paylanması baxımından pulsasiya sərfli zolaqlarla suvarma, yağışyağdırma və damcılarla suvarma səviyyəsində yüksək keyfiyyətə malikdir. Tarla boyunca torpağın bərabər nəmlənmə əmsalı yağış yağdırma suvarmasından yüksək olaraq, damcılarla suvarma səviyyəsinə yüksəlir.

**Cədvəl 1.** Təcrübənin variantları üzrə dövrü və ümumi suvarma normaları (zolaqların uzunluğu L=300 m)

| Təcrübə aparılan illər | Suvarmaların aparılan tarixləri | Suvarmaların №-si | I variant Zolaqlarla suvarma (nəzarət) | | | | II variant Su sonu çatmamış kəsilən zolaqlarla suvarma | | | | III variant Pulsasiya sərfli zolaqlarla suvarma | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | Suvarmanın davametmə müddəti | Zolaqlara buraxılan su sərfi l/san | Dövrü suvarma normaları m³/ha | | Suvarmanın davametmə müddəti | Zolaqlara buraxılan su sərfi l/san | Dövrü suvarma normaları m³/ha | | Suvarmanın davametmə müddəti | Fasilə vaxtı,s aat | Tskillərin davametmə müddəti, saat | Zolaqlara buraxılan su sərfi l/san | Dövrü suvarma normaları m³/ha | |
| | | | | | tələb olunan | faktiki verilən | | | tələb olunan | faktiki verilən | | | | | tələb olunan | faktiki verilən |
| 2008 | 03.XI | 1 | 9s.40 d | 6 | 670,7 | 750 | 8s.40d | 6 | 670,7 | 671 | 8s.40d | 8s.40d | 17s.20d | 6 | 670,7 | 674 |
| 2009 | 05.II | 2 | 7 s.30 d | 6 | 510,5 | 580 | 6s.40d | 6 | 510,5 | 511 | 6s.40d | 6s.40d | 13s.20d | 6 | 510,5 | 512 |
| 2009 | 06.IV | 3 | 9,0 s. | 6 | 645,6 | 700 | 8s.25d | 6 | 645,6 | 647 | 8s.20d | 8s.20d | 16s.40d | 6 | 645,6 | 647 |
| 2009 | 02.VI | 4 | 10 s20 d. | 6 | 740,7 | 790 | 9s.40d | 6 | 740,7 | 741 | 9s.30d | 9s.30d | 19s. | 6 | 740,7 | 742 |
| **Ümumi suvarma norması:** | | | | | | **2820** | | | | **2570** | | | | | | **2575** |
| 2009 | 08.XI | 1 | 5 s.25d | 6 | 350,4 | 420 | 4s 30d | 6 | 350,4 | 352 | 4s 30d | 4s 30d | 9s. | 6 | 350,4 | 353 |
| 2010 | 10.I | 2 | 9,0 s. | 6 | 640,6 | 700 | 8s.20d | 6 | 640,6 | 642 | 8s.20d | 8s.20d | 16s.40d | 6 | 640,6 | 642 |
| 2010 | 27.V | 3 | 8,0 s. | 6 | 570,6 | 620 | 7s.20d | 6 | 570,6 | 571 | 7s.20d | 7s.20d | 14s.40d | 6 | 570,6 | 572 |
| **Ümumi suvarma norması:** | | | | | | **1740** | | | | **1565** | | | | | | **1567** |
| 2010 | 05.XI | 1 | 6 s.25 d | 6 | 414,4 | 500 | 5s.20d | 6 | 414,4 | 415 | 5s.20d | 5s.20d | 10s.40d | 6 | 414,4 | 416 |
| 2010 | 10.XI | 2 | 8s.40 d | 6 | 620,0 | 680 | 6s.40d | 6 | 620,0 | 621 | 8s. | 8s. | 16s. | 6 | 620,0 | 621 |
| **Ümumi suvarma norması:** | | | | | | **1180** | | | | **1036** | | | | | | **1037** |

**Cədvəl 2.** Təcrübənin variantları üzrə suvarma suyuna edilən qənaət haqqında

| Tədqiq olunan suvarmalar | Təcrübənin variantları | Təcrübə aparılan illər | Orta dövrü suvarma norması m³/ha | Suvarmaların sayı | Vegetasiya suvarma normaları m³/ha | Təcrübənin I variantına nisbətən suya qənaət m³/ha | % |
|---|---|---|---|---|---|---|---|
| Sabit sərfli zolaqlarla suvarma, (nəzarət variantı) | I | 2008-2009 | 705 | 4 | 2820 | - | - |
| | | 2009-2010 | 580 | 3 | 1740 | | |
| | | 2010-2011 | 590 | 2 | 1180 | | |
| | | **Illər üzrə orta** | **625** | **3** | **1913,9** | | |
| Zolaqda suyu sona çatmadan kəsilən suvarma | II | 2008-2009 | 642,5 | 4 | 2570 | 250 | 8,9 |
| | | 2009-2010 | 521,7 | 3 | 1565 | 175 | 10 |
| | | 2010-2011 | 518 | 2 | 1036 | 144 | 12,2 |
| | | **Illər üzrə orta** | **574,5** | **3** | **1723** | **190,9** | **10** |
| Pulsasiya sərfli zolaqlarla suvarma | III | 2008-2009 | 643,75 | 4 | 2575 | 245 | 8,7 |
| | | 2009-2010 | 522,3 | 3 | 1567 | 173 | 9,9 |
| | | 2010-2011 | 518,5 | 2 | 1037 | 143 | 12,12 |
| | | **Illər üzrə orta** | **561,5** | **3** | **1726,3** | **187,6** | **9,8** |

**Cədvəl 3.** Təcrübənin variantları ilə təsərrüfat şəraitində aparılan suvarma normalarının müqayisəsi

| Təcrübənin variantları | Təcrübə aparılan illər | Suvarmaların sayı | Orta dövrü suvarma norması m³/ha | Vegetasiya suvarma normaları m³/ha | Təsərrüfatlarda aparılan suvurmalara nisbətən suya qənaət m³/ha | % |
|---|---|---|---|---|---|---|
| Təsərrüfat şəraitində aparılan suvarma | 2009-2010-cu təsərrüfat ili | 3 | 1000 | 3000 | - | - |
| Təcrübənin I variantı | 2009-2010-cu təsərrüfat ili | 3 | 580 | 1740 | 1260 | 42,0 |
| Təcrübənin II variantı | 2009-2010-cu təsərrüfat ili | 3 | 521,7 | 1565 | 1435 | 47,8 |
| Təcrübənin III variantı | 2009-2010-cu təsərrüfat ili | 3 | 522 | 1566 | 1434 | 47,8 |

Aparılmış tədqiqat işinin səmərəliliyini təyin etmək üçün, təcrübə sahəsində payızlıq buğdanın variantlar üzrə məhsuldarlığı təyin edilmişdir. Alınan nəticələr göstərir ki, təcrübənin I variantında (nəzarət variantda) payızlıq buğdanın məhsuldarlığı: 2008-2009-cu təsərrüfat ilində – 26,6 sen/ha, 2009-2010-cu təsərrüfat ilində – 26,7 sen/ha, 2010-2011-ci təsərrüfat ilində isə 27 sen/ha təşkil etmişdir. Üç ildə orta məhsuldarlıq 26,8 sen/ha olmuşdur. Uyğun olaraq təcrübənin II variantında su sona çatmamış kəsilən zolaqlarla suvarmada: 2008-2009-cu təsərrüfat ilində 26,8; 2009-2010-cu təsərrüfat ilində 26,7; 2010-2011-ci təsərrüfat ilində isə 27 sen/ha təşkil etmişdir. Üç illik orta məhsuldarlıq birinci variantda olduğu kimi 26,8 sen/ha omluşdur. Təcrübənin III variantında pulsasiya sərfli zolaqlarla suvarmada məhsuldarlıq: 2008-2009-cu təsərrüfat ilində 29,6 sen/ha, 2009-2010-cu təsərrüfat ilində 30,5 sen/ha, 2010-2011-ci təsərrüfat ilində isə 32 sen/ha olmuşdur. Üç illik orta məhsuldarlıq 30,7 sen/ha təşkil etmişdir. Təcrübənin I və II variantları üzrə suvarılan sahələrdən alınan məhsuldarlıq eyni olmuşdur (26,8 sen/ha). Lakin III variantda pulsasiya sərfli zolaqlarla suvarmada məhsuldarlıq I və II variantlardan çox olmuşdur. Belə ki, təcrübə aparılan təsərrüfat illərinə müvafiq olaraq pulsasiya üsulu ilə suvarılan sahədən 3; 3,8 və 5 sen/ha əlavə məhsul əldə edilmişdir, bu baxımdan 3 illik orta göstərici 3,9 sen/ha təşkil edir ki, bu da 14,7% məhsul artımı deməkdir.

Suvarma sahəsində aparılan elmi-tədqiqat işlərində variantlar üzrə alınan nəticələrin müqayisə edilməsi üçün vahid məhsul istehsalına sərf olunan suyun həcminin təyin edilməsi ən mühüm amillərdən biridir.

Bu baxımdan vahid məhsul istehsalına sərf olunan üç illik orta su həcmi pulsasiya sərfli zolaqlarla suvarmada (III variantda) 54,5 m³/sen. təşkil etdiyi halda I variantda (nəzarət variantında) 72,6 m³/sen, II variantda isə 64,3 m³/sen. təşkil etmişdir. Müqayisəli təhlil etdikdə görürük ki, pulsasiya sərfli zolaqlarla suvarmada (təcrübənin III variantında) 1 sentner payızlıq buğda məhsulunun istehsalına: nəzarət variantından (I variantdan) - 1,4 dəfə; II variantdan -1,18 dəfə az su sərf olunur. Bu göstəriciyə görə də pulsasiya sərfli zolaqlarla suvarma başqa göstəricilər kimi çox yüksək səmərəyə malikdir.

## NƏTICƏ

1. Vegetasiya suvarma norması pulsasiya texnologiyası ilə suvarmada 1037-2575 $m^3$/ ha olduğu halda nəzarət variantında 1180-2820 $m^3$/ha təşkil etmişdir.

2. Pulsasiya texnologiyası ilə suvarmada suvarma suyuna nəzarət variantına nisbətən 10%-ə qədər qənaət edilmişdir.

3. Təsərrüfat variantı ilə müqayisədə, pulsasiya texnologiyası ilə suvarmada suvarma suyuna 47,8%-ə qədər qənaət olunur.

4. Vahid məhsul istehsalına adi sabit sərfli zolaqlarla suvarmada (nəzarət variantında) 72.6 $m^3$/sentner su sərf olunduğu halda, pulsasiya texnologiyası ilə suvarmada 54.5 $m^3$/sentner su sərf olunmuşdur.

5. Pulsasiya üsulu ilə suvarma texnologiyası ilə suvarmada hər hektardan 3-5 sentner əlavə məhsul alınmışdır.

## ƏDƏBIYYAT

**Bəşirov N.B.** (1999) Mütərəqqi suvarma texnikası. Bakı: Elm, 139 s.

**Quliyev A.M.** (2011) Taxılın pulsasiya texnologiyası ilə suvarılması. Aqrar elmi jurnalı, **№1:** 127-128

**Сафаров Д.Х.** (2009) Пульсирующее бороздовое орошение хлопчатников Муганской степи. Юг России: экология, развитие, **№2:** 136-139

**А.М. Кулиев**

### Влияние Пульсирующей Технологии Орошения Пшеницы на Качество Полива и Увеличение Урожайности

Статья посвящена результатам четырехлетних исследований (2008-2011 гг.) влияния пульсирующей технологии орошения на увеличение урожайности и повышения качества полива. Проведенные исследования выявили высокое качество пульсирующего полива озимой пшеницы относительно обычного полосового полива. При применении пульсирующего полива полностью выравниваются глубины увлажнения почвы по длине поливных полос, т.е. коэффициент равномерности глубины увлажнения относительно контрольного варианта повышается от 0,48 до уровеня 0,95. При этом качество полива повышается примерно в два раза, за счет этого с каждого гектара дополнительно получается 3-5 центнеров зерна.

**A.M.Guliyev**

### Influence of Irrigation Pulsing Technology on Increase in Productivity and Increase Quality Of Watering

Article is devoted results of 4 years researches (2008-2011): influence of pulsing technology irrigation on increase in productivity and watering improvement of quality. At the spent researches are revealed high quality of pulsing watering winter wheat's concerning usual strip watering at which application depths of humidifying of soil on length of irrigation strips, etc are completely leveled. The factor of uniformity of depth of humidifying concerning a control variant raises from 0,48 on level 0,95. Thus quality of watering raises approximately in 2 times, at the expense of it from each hectare 3-5 centners of grain in addition turn out.

# ƏHLİMAN ƏMİRASLANOV - 65

## GÖRKƏMLI ALIM VƏ ICTIMAI XADIM



Əhliman Tapdıq oğlu Əmiraslanov 17 noyabr 1947-ci ildə Qərbi Azərbaycanın Göyçə Mahalının Basarkeçər rayonunun Zod kəndində ziyalı ailəsində anadan olmuşdur. 1965-ci ildə orta məktəbi qızıl medalla bitirərək N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə daxil olmuşdur. İnstitutda təhsil alarkən fitri istetadı, yüksək erudisiyası ilə fərqlənən gənc tələbə Əmiraslanov onkologiya sahəsinə daha çox meyl göstərmiş və 1969-cu ildə hələ tələbə ikən, Bakı şəhər kliniki onkologiya xəstəxanasında tibb qardaşı vəzifəsində əmək fəaliyyətinə başlamışdır. O, 1971-ci ildə institutu fərqlənmə diplomu ilə bitirmiş və 1971–1974-cü illərdə Bakı şəhər kliniki onkologiya xəstəxanasının cərrahiyyə şöbəsində həkim-ordinator və şöbə müdiri vəzifələrində çalışmışdır. Ə.T.Əmiraslanov 1974-cü ildə müvəffəqiyyətlə imtahan verərək Moskva şəhərində SSRİ Tibb Elmləri Akademiyasının (TEA) Ümumittifaq Onkoloji Elmi Mərkəzi (ÜOEM) nəzdində aspiranturaya daxil olmuşdur. 1977-ci ildə aspiranturada təhsil müddəti başa çatmamış, «Bədxassəli şişlərlə əlaqədar aşağı ətrafların amputasiyasından sonra xəstələrin reabilitasiyası» mövzusunda namizədlik dissertasiyası müdafiə etmiş və tibb elmləri namizədi elmi dərəcəsi almışdır. Ə.T.Əmiraslanov 1977-ci ildən Moskvada SSRİ TEA ÜOEM-inin ümumi onkologiya şöbəsində kiçik elmi işçi, elmi işçi, böyük elmi işçi vəzifələrində çalımışdır. Bu dövrlərdə çoxlu miqdarda mürəkkəb cərrahiyyə əməliyyatlarını, o cümlədən, dünyanın bir neçə məşhur klinikasında icra olunan və SSRİ miqyasında ilk dəfə Azərbaycan alimi Ə.T.Əmiraslanov tərəfindən həyata keçirilən «Rotasion plastika» cərrahiyyə əməliyyatı böyük məharətlə yerinə yetirilmişdir. Gənc alim elmi axtarışlarını uğurla davam etdirmiş, 1984-cü ildə «Osteogen sarkomalı xəstələrin kompleks müalicə üsulları» mövzusunda doktorluq dissertasiyası müdafiə edərək tibb elmləri doktoru elmi dərəcəsinə layiq görülmüşdür.

Ə.T.Əmiraslanov 1979 –1985-ci illər ərzində Moskvada apardığı səmərəli elmi – tədqiqat işlərinə görə ardıcıl olaraq SSRİ TEA Ümumittifaq Onkoloji Elmi Mərkəzinin rəhbərliyi tərəfindən müxtəlif mükafatlara layiq görülmüşdür. Həmin illər ərzində ümumi onkologiya şöbəsində «Sümük şişlərinin müalicə metodlarının təkmilləşdirilməsi» mövzusu üzrə cavabdehlik görkəmli alim Ə.T. Əmiraslanova tapşırılmış və o, bu vəzifənin öhdəsindən bacarıqla gəlmişdir.

Ə.T.Əmiraslanov ardıcıl olaraq bir neçə elmi tapıntını müvəffəqiyyətlə praktikaya tətbiq etmişdir. Belə tapıntılar sırasında dayaq – hərəkət aparatı şişləri zamanı bərpa müalicəsi metodları əsas yer tutur. Ə.T.Əmiraslanov keçən əsrin 70–80-ci illərində «Dayaq – hərəkət aparatı şişləri olan xəstələrin reabilitasiyası və müalicəsi» üzrə Ümumittifaq Məktəbinə rəhbərlik etmiş və dəfələrlə SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin qızıl medalları ilə təltif edilmişdir.

Ə.T.Əmiraslanovun məhsuldar fəaliyyəti 1985–ci ildə «Sümük sarkomaları» adlı monoqrafiyada öz

əksini tapmış və bu orijinal monoqrafiyaya görə o, SSRİ Tibb Elmləri Akademiyasının 5 ildə bir dəfə təqdim edilən «akademik N.N.Petrov adına» mükafatı və medalı ilə təltif edilmişdir.

Dünyada tanınan və layiqli nüfuz qazanan alim 1986-cı ildə elm və texnika sahəsində «Onkoloji xəstələrin bərpa müalicəsi metodlarının işlənib hazırlanması və onların klinik təcrübədə tətbiqi» haqqındakı silsilə elmi – texnoloji işlərinə görə SSRİ Dövlət Mükafatı laureatına layiq görülmüşdür.

1987-ci il iyunun 18-də Ə.T.Əmiraslanov ÜOEM-in ümumi onkologiya şöbəsində aparıcı elmi işçi vəzifəsinə təsdiq edilmiş, 1989-cu ildə həmin şöbədə professor vəzifəsinə seçilmiş və 1992-ci ilə qədər həmin vəzifədə çalışmışdır.

Akademik Ə.T.Əmiraslanov Rusiya Tibb Elmləri Akademiyasının Onkoloji Elmi Mərkəzində praktik işlə bərabər, elmi – təşkilati işlərlə də məşğul olmuşdur. O, həmin illərdə «Onkologiya» ixtisası üzrə İxtisaslaşdırılmış Elmi Şuranın, həmçinin Rusiya Tibb Elmləri Akademiyasının (RTEA) Onkoloji Elmi Mərkəzinin Elmi Şurasının üzvü olmuş, Moskvada işlədiyi müddətdə 12 tibb elmləri namizədi və 5 tibb elmləri doktoru işinə bilavasitə rəhbərlik etmişdir.

Akademik Ə.T.Əmiraslanov 1991-ci ildə yüksək ixtisaslı tibb kadrları hazırlığındakı, eləcə də tibb elminin və səhiyyənin inkişafındakı görkəmli xidmətlərinə görə «Əməkdar elm xadimi» fəxri adına layiq görülmüşdür.

Keçən əsrin 80-ci illərinin sonu, 90-cı illərinin əvvəlləri Azərbaycan üçün çox çətin olan illərdə bir çox mütəxəssislərin vətəni tərk edib başqa ölkələrə getdiyi bir zamanda, Əhliman Əmiraslanov Moskvadan Bakıya gəlməyi və öz peşəkar həkimliyi ilə xalqa dayaq olmağı qərarlaşdırdı. O, öz xeyirxahlığı, təmənnasız xidməti ilə tezliklə əhalinin hörmət və məhəbbətini qazandı.

Akademik Ə.T.Əmiraslanov 19 ildən artıqdır ki, Azərbaycan Tibb Universitetinin rektoru vəzifəsində çalışır və hazırda da bu vəzifəni şərəflə yerinə yetirir. Ə.T.Əmiraslanov eyni zamanda 1993-cü il martın 23-də müsabiqə yolu ilə Azərbaycan Tibb Universitetinin onkologiya kafedrasının müdiri vəzifəsinə seçilmişdir. O, 2007-ci ildə Azərbaycan Milli Elmlər Akademiyasının Biologiya Elmləri Bölməsinin akademik- katibi seçilmişdır.

Alim öz doğma xalqına, vətəninə xidmət etməyi özünün borc hesab edir. ATU-nun Onkoloji Klinikasında daim xəstələri qəbul edir, məsləhətlər verir və mürəkkəb cərrahi əməliyyatı bilavasitə özü həyata keçirir. Ona görə də xalq onu təkcə dünya şöhrətli alim, bacarıqlı təşkilatçı, səriştəli təhsil işçisi kimi deyil, həm də qayğıkeş və ünsiyyətli bir həkim kimi tanıyır və sevir.

Akademik Ə.T.Əmiraslanovun elmi-tədqiqatlarının əsasını dayaq – hərəkət aparatı, yumşaq toxumalar və bir sıra daxili orqanların, həmçinin vəzilərin bədxassəli şişlərinin öyrənilməsi, eləcə də onların effektli müalicə metodlarının və profilaktikasının işlənib hazırlanması, bu metodların praktikada uğurla tətbiq edilməsi təşkil edir. Akademik Ə.T.Əmiraslanovun bu sahədə təklif etdiyi yeni müalicə metodları artıq sınaqdan çıxaraq praktik səhiyyədə müvəffəqiyyətlə tətbiq olunur və hazırda ondan müxtəlif klinikalarda geniş miqyasda istifadə edilir. Onun təklif etdiyi müasir müalicə metodu xəstəliyin uzaq nəticələrini yaxşılışdırır, əlillik dərəcəsini azaldır, qısa müddətdə xəstələrin aktiv əməyə və məişətə qayıtmalarına kömək edir.

Akademik Ə.T.Əmiraslanovun elmi işləri nəinki ölkəmizdə və MDB ölkələrində, eləcə də dünyanın digər qabaqcıl ölkələrində geniş yayılaraq onkologiya elmində yeni mərhələnin başlanmasına əsaslı zəmin yaratmışdır. O, dəfələrlə Amerika Birləşmiş Ştatlarında, Fransada, Yaponiyada, İtaliyada, İsveçdə, Yunanıstanda, Macarıstanda, Bolqarıstanda, Çexiyada, Almaniyada, Sinqapurda, Türkiyədə, Rusiya Federasiyasında, Polşada, İsraildə, Pakistanda, Kanadada, İranda, Avstriyada və digər ölkələrdə keçirilən qurultay, simpozium, konqres və konfranslarda elmi məruzələrlə çıxışlar etmiş, onkologiya sahəsində əldə etdiyi yenilikləri beynəlxalq miqyasda böyük müvəffəqiyyətlə nümayiş etdirmişdir.

Akademik Ə.T.Əmiraslanov 400-dən çox elmi əsərin müəllifidir. Onun əsərlərinin böyük əksəriyyəti dünyanın bir çox ölkələrinin nüfuzlu jurnal, toplu və məcmuələrində nəşr edilmişdir. Əsərlərindən 18-i monoqrafiya, 16-sı ixtira və səmərələşdirici təkliflər, 28-i dərslik və dərs vəsaiti, 20-si metodik tövsiyədir. Akademik Ə.T.Əmiraslanovun «Onkologiya» adlı ilk orijinal dərsliyi azərbaycanlı tələbələr üçün əvəzsiz töhfə olmuşdur. Onun 1995-ci ildə Ankarada çapdan çıxan «Bədxassəli sümük şişlərinin proqnozu», 1999-cu ildə çap olunan «Onkoloji kaxeksiya» adlı monoqrafiyaları da geniş oxucu kütləsi tərəfindən rəğbətlə qarşılanmışdır.

Akademik Ə.T.Əmiraslanov elmi – pedaqoji kadrların hazırlanması məsələsinə xüsusi diqqət yetirir və bu sahədə də məhsuldar çalışaraq öz yetişdirmələrinə tələbkarlığı bir an belə azaltmadan, böyük qayğı, yüksək həssaslıqla yanaşır. Əhliman Əmiraslanov məktəbinin yetişdirmələri nəinki Azərbaycanın, eləcə də keçmiş SSRİ– nin müxtəlif klinikalarında çalışaraq, onun yolunu davam etdirirlər. Ə.T.Əmiraslanovun bilavasitə rəhbərliyi altında 42 nəfər dissertasiya müdafiə etmiş və

onlardan 32 nəfəri tibb elmləri namizədi, 10 nəfəri isə tibb elmləri doktoru elmi dərəcəsinə layiq görülmüşdür.

Akademik Ə.T.Əmiraslanov «Azərbaycan Tibb Jurnalının» və «Sağlamlıq» jurnalının redaksiya heyətinin üzvüdür. O, ATU-nun «Təbib» nəşriyyatının yaradıcılarından biri kimi geniş diapazonlu nəşriyyat işlərinin həyata keçirilməsində aktiv rol oynayır.

Akademik Ə.T.Əmiraslanov Azərbaycan Milli Elmlər Akademiyasının, Rusiya Təbiət Elmləri Akademiyasının, Rusiya Tibb Elmləri Akademiyasının, Polşa Tibb Elmləri Akademiyasının həqiqi üzvü, Ümumdünya Tibb Akademiyasinin, Ümumdünya Ortoped–Travmatoloq və Onkoloqlar Assosiasiyalarının, Yunanıstan, Çexiya, Macarıstan Onkoloqlar Cəmiyyətlərinin, Avropa Bərpa Cərrahlığı Assosiasiyasının, Amerika Klinik Onkoloqlar Cəmiyyətinin üzvüdür.

Akademik Ə.T.Əmiraslanov 2000-ci ildə Azərbaycan Respublikasının ali mükafatı – "Şöhrət" ordeni ilə təltif olunmuşdur. Polşa Tibb Elmləri Akademiyasının Albert Şvaytzer adına mükafata və Böyük qızıl medalına (1999), RTEA akademik N.N. Bloxin adına qızıl medalına (2007), Rusiyanın «XXI yüzilliyin liderləri» proqramı çərçivəsində «Millətin intellekti» adlı beynəlxalq təltifə (2009) layiq görülmüşdür.

O, 1990-cı ildə 12-ci çağırış Azərbaycan SSR Ali Sovetinin, 2010-cu ildə Azərbaycan Respublikası Milli Məclisinin deputatı seçilmiş, Azərbaycan dövlətinin və xalqının mənafeyini müdafiə edən məsələlərin müzakirəsində, ərazi bütövlüyümüz, müstəqilliyimiz və dövlətçiliyimizin qorunmasında fəal iştirak etmişdir. O, həmçinin Müstəqil Dövlətlər Birliyinin iştirakçı dövlətlərinin Parlamentlərarası Assambleya Şurasının üzvü kimi də fəaliyyət göstərmişdir.

Akademik Ə.T. Əmiraslanov 1999-cu ildə YUNESKO xətti üzrə «Bioetika, elmi biliklərin və texnologiyaların etikası» Azərbaycan Milli Komitəsinin Rəyasət Heyətinin üzvü, YUNESKO-nun ekspertidir. Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun Himayədarları Şurasının, Azərbaycan Respublikası Dövlət Mükafatlarının verilməsi üzrə Komissiyanın, həmçinin «Azərbaycan Respublikası Milli Atlası»nın tərtibi üzrə redaksiya heyətinin üzvüdür. O, 2011-ci ildə Avropa Tibbi-Onkologiya Cəmiyyətinin həqiqi üzvü və Dünya Azərbaycanlılarının III qurultayında Dünya Azərbaycanlılarının Əlaqələndirmə Şurasının üzvü seçilmişdir.

Akademik Əhliman Əmiraslanov həm həkim, müəllim və böyül elmi-tədqiqat işləri aparan alim, həm də Azərbaycan Tibb Universitetinin rektoru və Milli Məclisin deputatı kimi yerinə yetirdiyi məsuliyyətli işlərin sabahını düşünərək daim axtarışlarını davam etdirir və Azərbaycan elmini beynəlxalq miqyasda ləyaqətlə təmsil edir.

**AMEA-nın prezidenti, akademik**
**MAHMUD KƏRIMOV**

# İBRAHIM ƏZIZOV - 65

***2012-ci il avqust ayının 5-də AMEA-nin müxbir üzvü, biologiya elmləri doktoru İbrahim Vahab oğlu Əzizovun 65 yaşı tamam olmuşdur.***



İbrahim Vahab oğlu Əzizov 1972-ci ildə bitki fiziologiyası ixtisası üzrə Azərbaycan Elmlər Akademiyasının Botanika Institutunun aspiranturasına daxil olmuşdur. Aspiranturada təhsil aldığı illərdə akademik Cəlal Əliyevin rəhbərliyi ilə məhsuldarlığına görə fərqlənən müxtəlif buğda sortlarında xlroroplastların fotokimyəvi fəallığını tədqiq etmiş, xloroplastların fəaliyyətilə bitkilərin yetişkənliyi və məhsuldarlığı arasında mövcud olan korrelyativ əlaqələri aşkar etmişdir. Müəyyən edilmişdr ki, yüksək məhsuldarlığa malik olan tezyetişən buğda sortlarının xloroplastlarında fotokimyəvi reaksiyaların sürəti ontogenezin ilkin mərhələlərində gecyetişən sortlara nisbətən daha yüksək olur. Bu dövrdə xloroplastların yüksək fotosintez fəaliyyəti nəticəsində sintez olunan assimilyatların bir hissəsi böyümə proseslərini təmin edir, digər hissəsi isə ehtiyat şəklində toplanaraq ontogenezin sonrakı dövründə sünbüllərin əmələ gəlməsinə və dənin dolmasına sərf olunur. Ona görə də ontogenetik inkişafın ilkin mərhələlərində fotokimyəvi reaksiyaların sürətinə görə sortun tez və ya gecyetişən olması haqqında qabaqcadan fikir yürütmək olar.

Aparılan tədqiqatların nəticələri çoxsaylı buğda genotipləri içərisindən daha perspektivli formaların aşkar edilməsində istifadə edilmişdir.İ.V. Əzizov bu tədqiqatlar zamanı alınan, elmi və praktiki əhəmiyyət kəsb edən nəticələr əsasında 1981-ci ildə namizədlik dissertasiyasını müdafiə etmişdir. Sonrakı illərdə İ.V. Əzizov xarici mühitin qeyri-əlverişli amillərin - yüksək temperatur, quraqlıq və şoranlığın müxtəlif buğda genotiplərinin xloroplastlarına və məhsuldarlığına təsirini tədqiq etmiş, bu işlərin nəticələri akademik Cəlal Əliyevin rəhbərliyi ilə alınan yeni buğda sortları arasından öyrənilən əlamətlərə görə daha davamlı formaların üzə çıxarılmasına kömək etmişdir. Əldə edilən məlumatlara əsasən belə nəticə çıxarılmışdır ki, buğdanın yüksək məhsuldarlığını və quraqlığa davamlılığını, həmçinin fotosintez reaksiyalarının intensivliyini və ilk sintez olunan maddələrin hərəkətini başlanğıc valideyn formaların düzgün seçilib çarpazlaşdırılması yolu ilə arzu olunan istiqamətə yönəltmək olar.

Alınan nəticələrə əsaslanaraq İ.V. Əzizov 1994-cü ildə akademik Cəlal Əliyevin rəhbərliyi ilə doktorluq dissertasiyası müdafiə edərək, biologiya elmləri doktoru elmi dərəcəsi almışdır.

İbrahim müəllim aprardığı elmi-tədqiqat işlərinin nəticələrinə görə bir sıra beynəlxalq elmi konqreslərə dəvət alaraq məruzələrlə çıxış etmiş və onun əldə etdiyi nəticələr bu sahədə çalışan mütəxəssislərin marağına səbəb olmuşdur. O, öz elmi tədqiqatların nəticələrini 180 elmi əsərdə və bir monoqrafiyada dərc etmişdir.

İbrahim müəllim AMEA Botanika İnstitutunda 1975-ci ildə laborantlıqdan laboratoriya müdiri vəzifəsinə qədər yüksəlmişdir. 2001-ci ildə AMEA üzvlüyünə keçirilən seçkilərdə AMEA-nın müxbir üzvü seçilmişdir. 2005-ci ildə AMEA-nın 70 illik yubileyi münasibətilə elmi yaradıcılıq işlərində əldə etdiyi nailiyyətlərə görə Respublika Prezidenti tərəfindən «ŞÖHRƏT» ordeni ilə təltif edilmişdir.

İbrahim müəllimin elmi yaradıcılıq işləri onun pedaqoji fəaliyyəti ilə üzvi surətdə bağlıdır. O,1985-ci ildən Bakı Dövlət Universitetinin biologiya fakultəsində ixtisas fənnlərindən mühazirələr oxuyur, yüksək ixtisaslı bakalavr və magistr dissertasiyalarının hazırlanmasında fəal iştirak edir. Onun rəhbərliyi ilə 2 namizədlik və 5 magistr dissertasiyası müdafiə edilmişdir. Hal-hazırda bir neçə namizədlik dissertasiyasına bilavasitə rəhbərlik edir.

İ. V. Əzizov AMEA Biologiya və Tibb Elmləri Bölməsinin akademik katibinin müavini, Azərbaycan Respublikasının Prezidenti yanında AAK-nın Biologiya Elmləri Bölməsinin Ekspert

Komissiyasının sədri və Elmi-Tədqiqatların Təşkili və Əlaqələndirilməsi Şurasının Biologiya Elmləri Bölməsi üzrə Problem Şurasını Sədr müavini kimi Respublikada həyata keçirilən elmi-təşkilat işlərində fəal iştirak edir.

İbrahim Əzizovu 65 illik yubileyi münasibətilə İbrahim müəllimi səmimi qəlbdən təbrik edirik, ona möhkəm can sağlığı, həyatda və elmi yaradıcılığında yeni-yeni nailiyyətlər arzu edirik.

In: Droughts: New Research
Editors: D. F. Neves and J. D. Sanz

ISBN: 978-1-62100-769-2


*Chapter 2*

# PHYSIOLOGICAL AND MOLECULAR BASES OF DROUGHT TOLERANCE IN WHEAT (*TRITICUM* L.) GENOTYPES

***J.A. Aliyev****

Institute of Botany, Azerbaijan National Academy of Sciences, 40 Badamdar Shosse, Baku AZ 1073, Azerbaijan

## ABSTRACT

Several thousand wheat (*Triticum* L.) genotypes were grown in field conditions under normal water supply and a severe water deficit. *Triticum durum* L. genotypes distinguish by higher tolerances to water shortage than those of *Triticum aestivum* L. Under severe soil drought conditions during a period of the early spring tillering stage until the end of grain filling, grain yield and protein losses in numerous genotypes constitute within 25-65%. Ear photosynthesis plays a crucial role in crop accumulation and protein synthesis in grain. In tolerant to water stress genotypes, more than 60% of grain yield and protein synthesis is due to ear photosynthesis. Under dry conditions, the afternoon depression of leaf photosynthesis increased and the rate of dark respiration decreased. The rate of photosynthesis of 7- and 8-layered leaves in all genotypes in the evening, and especially in the morning hours, is higher. Photosynthetic rates of 7- and 8-layered leaves decreased greatly at the end of the milk ripeness and beginning of wax ripeness. Under the effect of drought and leaf aging, leaf area and accumulation of dry biomass shorten by more than half. After two weeks of drought, the intervarietal differences in photochemical activity, expressed in the higher reduction in extensive varieties in comparison with the intensive ones, are observed. Activities of Calvin cycle enzymes (phosphoglycerate kinase, NADP-glyceraldehyde dehydrogenase) decrease with strengthening of drought, especially in sensitive genotypes. Such a decline occurs more rapidly in the ear elements at the early stages of development of generative organs. Activity of enzymes of $C_4$ cycle (PEP-carboxylase, NAD- and NADP-malate dehydrogenase, aspartate aminotransferase) in $C_3$ plants under soil drought in leaves and ear elements increases significantly and the pyruvate orthophosphate dikinase is activated. The correlation between the genetically determined tolerance of wheat

* E-mail:aliyev-j@botany-az.org


И.М.Гусейнова, Н.Ф.Султанова, А.Ч.Маммадов,
Д.А.Алиев
ВИРУСНЫЕ ЗАБОЛЕВАНИЯ,
ПОРАЖАЮЩИЕ ОВОЩНЫЕ КУЛЬТУРЫ
В АЗЕРБАЙДЖАНЕ
ELM

***Буклет печатается при финансовой поддержке
Фонда развития науки при Президенте
Азербайджанской Республики ((EIF-2011-1(3)-82/48/3)***

**И.М.Гусейнова, Н.Ф.Султанова, А.Ч.Маммадов, Д.А.Алиев.**
***«Вирусные заболевания, поражающие овощные культуры в Азербайджане».***

ISBN 978 – 9952 – 453 – 34 – 8

В буклете даны общие понятия о биотическом стрессе, где большое внимание отведено вирусным заболеваниям. Представлена современная классификация вирусов и сведения о топ вирусах, рассмотрены типы и возбудители вирусных заболеваний. Подробно изложены основные симптомы заболеваний растений, вызываемых ДНК – содержащими вирусами. Рассмотрено, также, экономическое значение вирусов и профилактические меры борьбы против них. В заключении буклета дана карта регионов Азербайджана, где были обнаружены и идентифицированы вирусы растений.

Буклет может быть интересным для фитопатологов, агрономов, фермеров и для студентов сельскохозяйственных университетов.

655(07) – 2012

**«Элм» – 2012**

Balakişiyeva G.Ş., Məmmədov Ə.Ç., Hüseynova İ.M.

# AZƏRBAYCANDA FİTOPLAZMA XƏSTƏLİKLƏRİ



*Buklet Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun maliyyə dəstəyi ilə ((EIF-2011-1(3)-82/48/3 saylı qrant) çap edilmişdir.*

**Balakişiyeva G.Ş., Məmmədov Ə.Ç., Hüseynova İ.M**
*Azərbaycanda fitoplazma xəstəlikləri*

ISBN 978 – 9952 – 453 – 45 – 4

Oxuculara təqdim olunan bukletdə fitoplazmalar haqqında ümumi məlumat verilmişdir. Fitoplazmaların müasir təsnifatı təqdim edilmiş, təhlükəli fitoplazma xəstəlikləri, onların sahib bitkiləri və daşıyıcı həşərat vektorları nəzərdən keçirilmişdir. Fitoplazmaların törətdikləri xəstəliklərin əlamətləri ətraflı təsvir edilmişdir. Bukletdə həmçinin fitoplazmalara qarşı mübarizə üsullarına da xüsusi yer ayrılmışdır. Azərbaycanın müxtəlif regionlarında aşkar edilmiş fitoplazmalar haqqında məlumatla yanaşı, onların bitkilərdə yaratdıqları xarakterik əlamətlərin şəkilləri də yerləşdirilmişdir.

Buklet fitopatoloqlar, aqronomlar, fermerlər və kənd təsərrüfatı universitetlərinin tələbələri üçün maraqlı ola bilər.

1906000000/650(07) – 2012